**KÖNÜL NƏHMƏTOVA**

# ABBASQULU AĞA BAKIXANOVUN "KİTABİ-ƏSGƏRİYYƏ" HEKAYƏSİ

**"Elm və thəsil"**
**Bakı - 2013**

***Elmi redaktor:*** **Nəzakət Məmmədli**
*Filologiya üzrə fəlsəfə doktoru*

***Rəyçilər:*** **Güldəniz Qocayeva**
*Filologiya üzrə fəlsəfə doktoru*
**Firudin Qurbanov**
*Filologiya üzrə fəlsəfə doktoru*

**Könül Nəhmətova. Abbasqulu Ağa Bakıxanovun "Kitabi-Əsgəriyyə" hekayəsi. Bakı, "Elm və təhsil", 2013, 116 səh.**

Kitabda ensiklopedist alim, görkəmli ədib Abbasqulu ağa Bakıxanovun "Kitabi-Əsgəriyyə" hekayəsinin tədqiqat tarixi ilk dəfə olaraq nəzərdən keçirilir, elmi təhlillərdəki mübahisəli məsələlərə aydınlıq gətirilir. Bu günə kimi lirik hekayə adlandırılan əsərin satirik istiqaməti üzə çıxarılır, kölgədə qalan bədii məziyyətləri işıqlandırılır. Hekayə üslubu qorunmaq şərti ilə sadələşdirilərək elmi ictimaiyyətin və geniş oxucu kütləsinin mütaliəsinə təqdim olunur.

$\frac{4603000000}{N098-2013}$ ***qrifli nəşr***

# G İ R İ Ş

Müasir elmi konsepsiyalarla çıxış edən ədəbiyyatşünaslığımız bu gün tarixi və nəzəri aspektdə sürətlə yeni-yeni uğurlara qədəm qoyma mərhələsindədir. Bu uğurların bir qismi də potensialını Azərbaycan ədəbiyyatında bədii nəsrin öyrənilməsinə sərf edən tədqiqatçılarımızın adına yazıla bilər. Lakin ədəbiyyatşünaslıq tariximizin belə bir mərhələsində XIX əsrin görkəmli alimi və ədibi olan Abbasqulu ağa Bakıxanovun bədii nəsrinin layiqincə öyrənilməməyi hələ ki görülən işlərin natamamlığından xəbət verir. Yazıçının bədii nəsrinə iki əsəri – "Riyazül-Qüds" və "Kitabi-Əsgəriyyə" əsərləri daxildir. Sovet dönəmində birinci əsər mövcud siyasi rejimin ideologiyasının tələbi ilə tədqiqatdan kənarlaşdırılaraq A.Bakıxanovun yazıçılar sırasında yeri məhdudlaşdırılmışdır. Son dövrlərdə bu sahədə müəyyən təşəbbüslərə[1] rast gəliriksə də, yazıçının haqqının bərpası prosesinin ləngidiyini hiss etməyə bilmirik.

Abbasqulu ağa Bakıxanovun "Kitabi-Əsgəriyyə" əsəri isə bədii nəsrin inkişaf tarixində önəmli bir mərhələni təşkil edən XIX əsrdə müasir tələblərə cavab verən ilk hekayələrdən biri[2] olduğu halda epik növün klassik ənənəsinin davamı kimi görülərək diqqətdən kənarda saxlanılmışdır. "Kitabi-Əsgəriyyə" hekayəsinin bir nüsxə belə əlyazmasının ələ gətirilə

---

[1] Möhsün Nağısoylu "Riyazül-Qüds" əsərini "klassik tərcümə nümunəsi kimi" tədqiqata cəlb etmişdir. Əsərin orijinalının transfoneliterasiya olunaraq üzə çıxarılması istiqamətində Əlyazmalar İnstitunda işlər aparılmaqdadır.

[2] "Kitabi-Əsgəriyyə"nin yazılma tarixi qəti müəyyənləşdirilmədiyindən və tədqiqatçıların əksəriyyətinin bu tarixi 1837-ci il kimi qəbul etmələri səbəbindən birincisi İsmayıl bəy Qutqaşınlının "Rəşid bəy və Səadət xanım" (1835) hekayəsi hesab olunur.

bilməməsi də onun tədqiqatına marağı azaltmışdır. Bu mənzərə ilk baxışda hekayənin öz dövründə yayılmadığı təəssüratını yaradır. Lakin faktlara daha diqqətlə nəzər saldıqda tamamilə fərqli nəticəyə gəlirik. Abbasqulu ağa təkcə bədii nəsr yaradıcısı kimi deyil, həm də bu məqsədyönlü fəaliyyəti ilə ədəbi dilin formalaşmasına xidmət edən dilçi alim kimi nəzərimizdə canlanır. Görkəmli ədibin 1828-ci ildə "Qanuni-Qüdsi" adında fars dilinin sərf və nəhvini sadə dildə uşaqlara öyrətmək məqsədi ilə yazdığı əsəri elm aləminə məlumdur. Tədqiqatçıların qeydlərinə görə, bu dərslik kitabı farsların özlərindən də çox qabaq dilin təlimi üçün yazılan ilk əsərlərdəndir. Əsər 1831-ci ildə fars dilində, 1841-ci ildə isə Tiflisdə rus dilində nəşr edilmişdir. "Kitabi-Əsgəriyyə" hekayəsinin də XIX əsrdə çap olunmuş qrammatika kitablarına daxil edilməsi maraq doğurmaya bilmir. Hekayə ilk dəfə "Zövi" təxəllüslü Mirzə Əbülhəsən bəy Vəzirovun 1861-ci ildə Peterburqda çap olunan "Qəvaidi-Zöviyyə" ("Zövi qaydaları") adlı türk dili dərsliyində ixtisarla və bəzi hissələri sadələşdirilərək verilmişdir. 1866-cı ildə isə M.Lazarevin "Türk dillərinin müqayisəli xarakteristikası" kitabına daxil edilmişdir. Faktlardan çıxış edərək belə qənaətə gəlirik ki, Abbasqulu ağa Bakıxanov "Kitabi-Əsgəriyyə" əsəri timsalında müasir tələblərə cavab verən bir hekayə nümunəsi yaratmaqla yanaşı, Azərbaycan türkcəsinin ədəbi dil normalarının müəyyənləşdirilməsinə də xidmət etməyə çalışmışdır. Hekayənin ədəbi dilimizin zənginliyinin ən incəliklərinə qədər diqqətə alınaraq yazılması da fikrimizin bir daha təsdiqində əsaslı dəlillərdəndir. Diqqətimizi çəkən ikinci mühüm məsələ isə hekayənin əlyazmasının müxtəlif variantlarda mövcud olmasıdır. Yuxarıda adı çəkilən dilçi alimlərin müxtəlif illərdə bu əsəri görüb onu çap etdirmələri də əlyazmanın yayılmasını ehtimal etməyə əsas verir. Bundan əlavə, 1946-cı ildə "Kitabi-Əsgəriyyə" hekayəsini transfoneliterasiya edərək kiril əlifbası ilə "Ədəbiyyat məcmuəsi"ndə dərc etdirən Həmid Araslı da

əlyazmanın iki nüsxəsi ilə "Qəvaidi-Zöviyyə" əsərindəki fərqlərdən bəhs edirdi. Hekayənin bir nüsxəsi Həmid Araslının fəaliyyəti dövründə AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun arxiv şöbəsində saxlanılsa da, bu gün yerində yoxdur, ya itirilmişdir, yaxud da ki, böyük ehtimalla kiminsə şəxsi arxivinə aparılmışdır. Əlyazmanın daha bir nüsxəsi haqqında Feyzulla Qasımzadə xəbər verir ki, Rusiya Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun Şərq Əlyazmaları şöbəsinin arxivində A-1066 şifrəsi altında saxlanılmışdır. İnternet saytlarından aldığımız daha bir məlumata görə, 1974-cü ildə hekayənin bir əlyazması da Təbriz kitabxanalarının birindən tapılmışdır. Bütün bu faktlar sübut edir ki, "Kitabi-Əsgəriyyə" hekayəsi bir əlyazma nüsxəsi kimi küncə atılaraq qalmamış, ayrı-ayrı katiblər tərəfindən üzü köçürülməklə yayılmışdır. Lakin talehsizlik üzündənmi, kifayət qədər qədirşünas olmamağımızdanmı bu gün əlimizdə hekayənin bir əlyazması belə yoxdur. Nə qədər gec deyil, əlyazmanın, heç olmazsa, surətini əldə etmək qarşımızda duran mühüm vəzifələrdəndir. Hekayəni dərindən təhlil edib yazıçının haqqını özünə qaytarmaq da dövrümüzün ədəbiyyatşünaslığının üzərinə düşən məsuliyyətlərdəndir. Bu gün əlimizin hər yerə çata biləcəyi bu şəraitdə, həqiqəti heç nədən çəkinməyərək söyləyə biləcəyimiz, nemətinə şükr etməli olduğumuz bu gündə üzərimizə düşən vəzifələri yerinə yetirməsək, tarix bizi bağışlamayacaq, elmimizin gələcək inkişaf səhifələrində adımız qaralanacaqdır!

"Kitabi-Əsgəriyyə" hekayəsinin öyrənilməsi məsələlərinə XX əsrin 50-ci illərindən sonra başlandığını görürük. Bu tarixdən etibarən qırx illik sovet ədəbiyyatşünaslığında hekayə bir sıra istiqamətlərdə tədqiqata cəlb olunmuş, müəllifin əks etdirmək istədiyi gerçəkliklər, həqiqətlər müəyyən qədər işıqlandırılmışdır. Lakin əsərin ehtiva etdiyi dini motivlər mövcud sərt siyasi rejimin diktəsi altında tədqiqatçıların qarşısında maneə kimi durduğuna görə

mövzuya səthi yanaşılmış, eyni zamanda, əsərin çətin dili də həqiqətin üzərinə çəkilən pərdəni bir daha qatılaşdırmışdır. Bu səbəblərdən hekayənin məzmunu gerçək qavranılmamışdır. Məzmunu yalnış anlaşılan əsərin ideya istiqaməti də doğru müəyyənləşdirilə bilməzdi. İlkin təhlillər də özündən sonra davamlı olaraq yanlışlıqlara yol açmışdır. Buna görə də hekayənin öyrənilməsi, tədqiqi tarixi araşdırmamızın əsas istiqmətlərindən biridir ki, bu sahədə yazılan əhəmiyyətli əsərləri təhlil süzgəcimizdən keçirərək görünən həqiqətləri dəyərləndirək, görünməyənləri isə üzə çıxarmaq şərəfinə nail olaq.

Araşdırmamızın əsas istiqamətləri əsərin ideya istiqamətini müəyyənləşdirmək, ekspressiv təsirini üzə çıxarmaq, poetika məsələlərini geniş işıqlandırmaqdır. Bu məsələlərin hərtərəfli öyrənilməsi hekayənin klassik ənənələrlə bağlarının çözümünə, özündən sonra açdığı yeniliklərin inkişaf yollarına gətirib çıxaracaqdır. Bu günə qədər yalnız lirik hekayə kimi öyrənilən hekayənin satirik əlamətlərinin üzə çıxarılması ədəbiyyatımızda inqilabi sıçrayışlarla inkişaf edən realizmlə tarixin inkişafına mütərəqqi addımlarla qoşulan Bakıxanovun əlaqəsini möhkəmləndirir.

“Kitabi-Əsgəriyyə” hekayəsinin bədii xüsusiyyətlərini öyrənmək bədii nəsrin gələcək inkişafındakı tendensiyaları da dəqiq qavramaq cəhətindən əhəmiyyətlidir. Azərbaycan ədəbiyyatında hələ ki görə bildiyimiz qədər özünü ilk dəfə Nəcəf bəy Vəzirovun hekayələrindən büruzə verərək Cəlil Məmmədquluzadənin, Əbdürrəhim bəy Haqverdiyevin hekayələrində daha mükəmməl nümunələrini qazanan ironik təhkiyə tipinin qaynaqlarını müəyyənləşdirmək üçün də “Kitabi-Əsgəriyyə” hekayəsinin öyrənilməsi zərurəti ilə qarşılaşırıq.

“Kitabi-Əsgəriyyə” hekayəsi, bir sıra alimlərin hesab etdiyi kimi, nə sənətkarlıq, nə də tematika baxımından ədəbiyyatımızın sonrakı inkişafından kənarda deyil. “Dövrün

ruhu və hər millətin təhsili həmişə ədəbiyyatda və digər abidələrdə öz əksini tapır" deyən Abbasqulu ağa Bakıxanov idealist baxışları sayəsində daha çox klassik ədəbi ənənələrlə əlaqələndirilən bədii yaradıcılığında məhz zamanın real həqiqətlərinə sadiq qalmağa, dövrünün, mühitinin əhval-ruhiyyəsini əks etdirməyə çalışmışdır. Bakıxanov üçün bu gün keçmişin arasıkəsilməz davamıdır və onun idealizmi dünyada mövcud olan, eyni zamanda, daim dəyişən fikir axınlarının təqibində əbədiyyətə qovuşacaq bir həqiqətdir.

Azərbaycan elminin və ədəbiyyatının inkişafında möhkəm özüllü bir tramplin kimi çıxış edən Bakıxanov dühası ömrünün son çağlarında realizminin və həmçinin estetik baxışlarının ən mükəmməl əsəri olan "Kitabi-Əsgəriyyə" hekayəsini, özünün də qeyd etdiyi kimi, "misilsiz kitab"ını bədii nəsr tariximizə bəxş etmişdir.

Abbasqulu ağa Bakıxanovun "Kitabi-Əsgəriyyə" hekayəsinin öyrənilməsi istiqamətində apardığımız araşdırma zamanı qaranlıq məsələlərin işıqlandırılması üçün elminin nurunu bizdən əsirgəməyən f.f.d. Mehmet Rıhtıma, i.f.d. Namiq Abuzərova, f.e.d. Fəridə xanım Əzizovaya, f.f.d. Elmira xanım Qasımovaya, İTV-nin "Cümə söhbəti" verilişinin aparıcısı, ilahiyyatçı Natiq Rəhimova, AMEA-nın Əlyazmalar İnstitutunun əməkdaşı Mustafa Əliyevə təşəkkürümüzü bildiririk.

# ABBASQULU AĞA BAKIXANOVUN "KİTABİ -ƏSGƏRİYYƏ" HEKAYƏSİNİN ÖYRƏNİLMƏSİ: MÜBAHİSƏLƏR, HƏQİQƏTLƏR

Azərbaycan elmi-fəlsəfi fikir tarixinə, bədii-estetik təfəkkürünə bir sıra əsaslı yenilikləri, mütərəqqi addımları, çoxistiqamətli maarifçilik fəaliyyəti ilə daxil olan Abbasqulu ağa Bakıxanovun elmi-ədəbi irsi dövrünün qabaqcıl ziyalılarının - tarixçilərin, mütəfəkkirlərin, ədiblərin diqqətini çəkmiş, dəyərləndirilmiş və onların fəaliyyətinə öz müsbət təsirini göstərmişdir. Abbasqulu ağa Bakıxanov öz dövründə hərbi xadim, tədqiqatçı-alim kimi tanınmaqla yanaşı bədii yaradıcılığına görə də sevilmişdir. Bədii əsərləri içərisində ədəbi mühitə ən gec məlum olanı "Kitabi-Əsgəriyyə" hekayəsidir. "Kitabi-Əsgəriyyə"nin dəqiq yazılma tarixi məlum deyildir. İlk dəfə bu hekayə 1861-ci ildə "Zövi" təxəllüslü Mirzə Əbülhəsən bəy Vəzirovun "Qəvaidi-Zöviyyə" ("Zövi qaydaları") adlı türk dili müntəxabatında ixtisarla və bəzi hissələri sadələşdirilərək verilmişdir [3]. 1866-cı ildə isə hekayə M.Lazarevin "Türk dillərinin müqayisəli xarakteristikası" kitabına daxil edilmişdir. Bu tarixdən etibarən 1925-ci ilə qədər mənbələrin hekayə ilə bağlı susduğunu müşahidə edirik.

Abbasqulu ağa Bakıxanovun yaradıcılığının tədqiqi tarixində "Kitabi-Əsgəriyyə" hekayəsi haqqında ilk qısa təhlil səciyyəli məlumatı Firidun bəy Köçərli vermişdir: "Quba əhlindən Əsgər adlı bir cavanın keyfiyyəti-halı və güzarişi-məalı xüsusunda təsnif olunmuşdur. Bu, xırdaca və baməzə, türk dilində nəsrən və nəzmən təlif olunmuş bir hekayədir.

[3] Мирза Абдулгасан бек Визиров. Учебник татарско-азербайджанского языка. СПб., 1981

Mərhum Mirzə Əbülhəsən bəy Vəzirov "Zövi" təxəllüsün "Qəvaidi-Zöviyyə" nam məcmuəsində təb olunmuşdur"[4]. Müəllif yazıçının əsərlərinin çətinliklə tapıldığını qeyd edib hekayədən əldə olan hissəni öz məqaləsinə daxil edərək əsərin üslubu və "hansı bir məslək və rəvişdə olması" haqqında təsəvvür yaratmağa çalışmışdır. Əsərin əldə olan parçalarından tədqiqatçı belə bir nəticəyə gəlir : "Könül evini eşq zövqü həvası ilə mə`mur edənlər və məhəbbət nuru ilə işıqlandıranlar, rəvişlərində pakbaz və müstəqim olanlar dəhrin cəfası müqabilində gərəkdir zindan kimi səxt dursunlar və dəsti-qəza yə`sü matəm çəkicini onların başına çaldıqda qəmü ələm çəkməsinlər; hər bir cəhətlərində öz qissə və niyyətlərində, rəviş və məsləklərində səbat və dəyanət göstərsinlər"[5].

Yusif Vəzir Çəmənzəminli 1935-ci ildə nəşr etdirdiyi "Abbasqulu ağa Qüdsinin əsərləri" məqaləsində A.A.Bakıxanovun ədəbiyyat tariximizdə yerini müəyyənləşdirərək yazırdı: "Ədəbiyyatımız tarixində Mirzə Fətəlidən sonra Şərq və az-çox Qərb elmlərinə vaqif bir adam varsa, o da Qüdsidir. Qüdsi türk, rus, fars və ərəb dillərini bilir, tədqiqat və mütaliəsi sayəsində müasirlərindən yüksək mövqe tutur"[6]. Ədib "Kitabi-Əsgəriyyə" haqqında məlumatları Firidun bəy Köçərliyə istinadən verir və əlavə olaraq qeyd edir ki, "Lazerev 1866-cı ildə Moskvada çap etdirdiyi "İntixabül-təsanif türki lisanda" adlı əsərində Kazım bəy Vəzirovun əsərləri ilə bərabər Qüdsinin "Əsgəriyyə"sindən də bir parça dərc etmişdir"[7]. XX əsrin ən inadkar, yorulmaz tədqiqatçılarından biri olan Salman

---

[4] F.Köçərli.Azərbaycan ədəbiyyatı. Bakı, Elm, 1978
[5] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı, I c., Bakı, 1878, səh. 295
[6] Y.V.Çəmənzəminli. Əsərləri 3, Bakı, Elm, 1977
[7] Yenə orada, səh.100

Mümtazın araşdırmalarında isə A.Bakıxanov haqqında heç bir məlumata rast gəlmirik.

Məhəmmədəli Tərbiyətin "Danişməndani-Azərbaycan" (1935) əsərində Bakıxanov haqqında məlumatlar "Füyuzat" jurnalına istinadən verilmişdir və burada da "Kitabi-Əsgəriyyə" adına təsadüf olunmur.

Böyük ictimai xadim, tanınmış alim və filosof olan Heydər Hüseynov "Azərbaycanda XIX əsr ictimai və fəlsəfi fikir tarixindən" adlı əsərində Abbasqulu ağa Bakıxanov haqqında yazdığı məqaləsində "Kitabi-Əsgəriyyə" hekayəsinin də adını çəkir və onu poema adlandırır. Əsərdəki qeyd yalnız bundan ibarətdir ki, "Bu poemada gənc qubalı Əsgərin həyatının təsvirini vermiş və azad sevgini bədii şəkildə mədh etmişdir"[8]. Məlum olur ki, Heydər Hüseynov da əsəri görməmişdir.

Hekayənin Quba şəhərindəki Ərdəbillilər məscidindən tapılıb AMEA-nın Nizami adına Ədəbiyyat və Dil İnstitutunun Əlyazmalar fondunda saxlanılan nüsxəsinin mükəmməl tənqidi mətni ilk dəfə Həmid Araslının transfonoliterasiyası ilə 1946-cı ildə İnstitutun əsərlərinin birinci cildində nəşr olunmuşdur. Həmid Araslı əlində olan əlyazma nüsxəsini Mirzə Əbülhəsən bəy Vəzirovun "Qəvaidi-Zöviyyə" əsərində ixtisarla verilmiş nümunə ilə müqayisəsini də oxuculara təqdim etmişdir. Buradan məlum olur ki, "Qəvaidi-Zöviyyə"də verilmiş nümunə ilə əlyazması arasında yalnız bəzi şeir bəndlərində fərqlər mövcud olmuşdur[9].

T.P.Ağayan da A.Bakıxanova həsr etdiyi monoqrafiyada "Kitabi-Əsgəriyyə" hekayəsinin sadəcə adını

---

[8] Heydər Hüseynov. Azərbaycanda XIX əsr ictimai və fəlsəfi fikir tarixindən. Bakı, 2005, səh.80

[9] Ədəbiyyat məcmuəsi. Cild 1., 1946.

çəkərək qeyd edirdi ki, “ailənin azad sevginin əsasında qurulması haqqındadır”[10].

Feyzulla Qasımzadə 1956-cı ildə nəşr etdirdiyi “Abbasqulu Ağa Bakıxanov” monoqrafiyasında “Kitabi-Əsgəriyyə”ni ilk bədii nəsr nümunəsi kimi araşdıraraq dəyərli fikirlərlə çıxış etmişdir, ilk dəfə olaraq “Kitabi-Əsgəriyyə”nin əlyazmasının SSRİ-nin EA-nın Şərqşünaslıq İnstitutunun Şərq Əlyazmaları Şöbəsində A-1066 şifrəsi altında mühafizə edilməsi haqqında məlumat vermişdir. F.Qasımzadə öz tədqiqatı üçün həmin nüsxədən istifadə etmişdir. Alim əsərin janrını lirik hekayə kimi müəyyənləşdirmişdir. F.Qasımzadə “Kitabi-Əsgəriyyə”ni klassik Şərq ədəbiyyatının və Füzuli ənənələrinin davamı kimi görsə də, aşiqlərin məhəbbətinin “adi və real bir şəraitdə cərəyan etməsini” qeyd edirdi: “Aşiqanə klassik poemalardakı coşğun hiss və həyəcan, atəşin məhəbbət, aşiqlərin “bixudluq” aləminə düşməsi, romantik xəyal və s., əlbəttə, burada yoxdur. “Təhzibül-əxlaq”da “etidal” (orta hədd) prinsipini müdafiə edən alim bədii əsərində də buna riayət edərək eşq məsələsində də buna riayət etmişdir”[11].

“Təhzibül-əxlaq” əsəri Bakıxanovun dünyagörüşünün konseptual ifadəsi olduğundan tədqiqatçının fikirlərinin sübutunda bu əsərə istinadı təqdirəlayiqdir. Müəllif əsərin bir çox yenilikləri ilə yanaşı bunu da qeyd edir ki, “Aşiqanə klassik poemaların romantik qəhrəmanları zadəgan sinfi içərisindən götürüldüyü halda, “Kitabi-Əsgəriyyə”nin qəhrəmanları adi insanların içərisindən götürülmüşdür. Əsgər dəmirçi oğludur, onun sevgilisi isə kiçik rütbəli ruhani qızıdır. A.Bakıxanov bunların simasında XIX əsr ədəbiyyatımızda ilk dəfə olaraq aşağı təbəqələrin həyatını əks etdirmişdir ki, bu da

[10] Aqayan T.P. A.Bakixanov. Bakı, 1948. səh. 129
[11] F.Qasımzadə. Abbasqulu ağa Bakıxanov. Bakı, 1956, səh. 135.

onun heç şübhəsiz, maarifçi dünyagörüşü ilə əlaqədardır”[12]. Lakin F.Qasımzadənin Əsgər “XIX əsr ədəbiyyatımızda rast gəldiyimiz gənc ziyalı surətlərinin ilk və hələ rüşeym halında olan nümayəndəsidir” [13] fikri ilə razılaşa bilmirik. Çünki Əsgərin idealı uğrunda mübarizə yolu elmdən və şəriət qanunlarından (İslam fiqhi) keçməli olduğu halda ruhaniliyi mərsiyəxanlıq simasında olan bir cəmiyyətin “dövrünün yeganəsi ”“ən fəzilətli aliminin” əsassız və mücərrəd anlayışlara -“eşq məzhəbinə”, “eşq təriqətinin başçısının hökmünə” əsasən verdiyi fitvasında ilişib qalır və çıxılmaza sürüklənir. Amma əsərdə göstərildiyi qədər cahil bir mühitdə Əsgərdən artıq qəhrəmanlıq gözləmək də qeyri-mümkün idi.

1958-ci ildə isə “Kitabi-Əsgəriyyə” hekayəsinin öyrənilməsi və tanıdılması istqamətində böyük bir əmək sərf olunur ki, bu da əsərin tərcümə-təbdil olunaraq “Azərbaycan hekayələri” kitabında çap olunmağıdır. Əsər M.Mübariz tərəfindən sadələşdirilərək H.Qasımzadənin tərtib etdiyi “Azərbaycan hekayələri”nə daxil edilmişdir [14]. Kitabın ön sözünün müəllifi Mikayıl Rzaquıuzadə hekayənin ideya istiqamətini müəyyənləşdirmək üçün yazırdı: “ Abbasqulu ağa Bakıxanov Qüdsinin “Kitabi-Əsgəriyyə”si məzmunca realistik mahiyyətdə yazılmış ilk hekayələrdəndir. İstedadlı və gözəl bir gənc olan dəmirçi oğlu Əsgər ilə ruhani alimin qızı arasındakı səmimi məhəbbətdən danışan bu hekayə dövrün müəyyən səciyyəvi əlamətlərini də əks etdirir. Hər iki gəncin valideyni tərəfindən narazılıq olmadığı halda bu gənclər uzun illər boyu bir-birinə qovuşa bilmirlər.[15]” Təhlildən göründüyü kimi alim Əsgərin və sevdiyi qızın atasının kimliyini dəqiq

[12] F.Qasımzadə. Abbasqulu ağa Bakıxanov. Bakı, 1956, səh.135.
[13] Yenə orada, səh.137.
[14] Azərbaycan hekayələri. İki cilddə, I cild. / Tərtib edəni:H.Qasımzadə/. Bakı, 1958, səh. 55-68
[15] Azərbaycan hekayələri. Bakı, 1958. Səh.8-9.

müəyyənləşdirə bilməmişdir. Əsgəri sadəcə "dəmirçi oğlu" kimi xarakterizə edən müəllif onun mərsiyəxan olduğunu sezməmişdir. Əsgərin sevdiyi qızın atası isə M.Rzaquluzadənin adlandırdığı kimi, "ruhani alim" olmayıb sadəcə bir mərsiyəxan idi ki, əsərdə "mərsiyəxanlar başçısı" adlandırılmaqla tanıdılır. M.Rzaquluzadə davam edərək yazırdı: "Lirik bir səpgidə yazılmış hekayənin baş qəhrəmanının bir dəmirçi oğlu olması, yəni müəllifin öz qəhrəmanını zəhmətkeş bir əsnaf ailəsindən seçməsi də diqqətəlayiq bir məsələdir. O zamankı qatı fanatizm və dini bidətlərin hökm sürdüyü bir mühitdə müəllifin azad məhəbbət məsələsini qoyması, şəriətin xilafına olaraq bir-birilə görüşdürməsi nəhayət bütün maniə və ziddiyyətlərə baxmayaraq, sevgililəri bir-birinə qovuşdurması – beləliklə, əsərin nikbin bir nəticə ilə qurtarması böyük tərbiyəvi əhəmiyyətə malikdir.[16]" Alimin "qatı fanatizm", "dini bidət" ifadələri ilə "şəriət" anlayışı arasında fərq görməməsi də təhlillərinin elmiliyini sual altına salır. Bunu da əlavə etmək istəyirik ki, M.Rzaquluzadə hekayənin sonunda Əsgərin sevgilisinə qovuşmasını yazırsa da, belə deyildir. Hekayə Əsgərin yuxusu ilə nəticələnir ki, burada aşiqin öz sevgilisinə yuxuda qovuşması göstərilir. Yuxudan ayılan aşiq buna, sadəcə, ümid bəsləməklə kifayətlənir. Göründüyü kimi, hekayənin məğzi M.Rzaquluzadəyə aydın olmamış, buna görə də əsərin ideyası öz doğru təhlilini qazana bilməmişdir.

"Azərbaycan hekayələri" kitabında "Kitabi-Əsgəriyyə" hekayəsi sadələşdirilmiş variantda verilmişdir. Hekayənin sadələşdirilərək təqdim olunması nə qədər zəruri idisə də, onun üslub incəliklərinin nəzərə alınmaması, sözlərin və cümlələrin dəqiqliklə tərcümə olunmaması ciddi xətalara yol açaraq əsərin bədii və elmi dəyərini aşağı salmışdır. Diqqət çəkən məsələlərdən biri də budur ki, kitabda Məhəmməd

[16] Azərbaycan hekayələri. Bakı, 1958, səh. 9.

Füzulinin “Şikayətnamə” əsərinin müasir dilimizə uyğunlaşdırılmasında üslubun saxlanılmağı əsas şərt kimi götürüldüyü halda, “Kitabi-Əsgəriyyə”də bu, əhəmiyyətli hesab olunmamışdır. Hekayələr toplusunda “Şikayətnamə”nin üslubunun saxlanılması haqqında xüsusi qeyd olunur: “Satiranın üslubu saxlanılmaqla M.Mübariz tərəfindən təbdil-tərcümə olunur”[17]. “Kitabi-Əsgəriyyə”nin isə tərcüməsi ilə bağlı olaraq yazılır ki, “Əsərin dili ərəb-fars ibarələri ilə dolu olduğu üçün M.Mübariz tərəfindən müasir Azərbaycan dilinə təbdil-tərcümə olunmuşdur”[18]. Tərtibçinin qeydlərində isə hekayənin yazılma tarixi heç bir mənbəyə istinad olunmadan 1842-ci il göstərilir[19]. Göstərilən tarix maraq doğursa da, mənbənin olmaması səbəbindən güvənə bilmirik.

“Kitabi-Əsgəriyyə” hekayəsini sadələşdirərkən M.Mübariz də M.Rzaquluzadə kimi, əsərin lirik cəzbəsinə düşərək elə üslubu da bu emosiyanın təsiri altında formalaşdırmışdır. Tərcüməçi əsərin giriş hissəsindən etibarən səhvlərə yol verməyə başlayır. Hekayə klassik ədəbiyyatın epik növünə xas “Dibaçə” ilə başlayır: “...Əmma bə`d pabəsteyi-səlasili-möhnət və giriftari-zindani-məhəbbət

Fərd

Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,
Bülbüli-gülzari-möhnət Qüdsiyi-şuridəhal

bu rəsmi dilaviz ilə firqeyi-ülul əlbabə bəyani-mafilbal etmiş və əlvahi- zəmairi-ərbabül-bəsairə bu şiveyi-zövqəngiz ilə qələmi-ə`lam yürütmüş ki, çün məzmuni-hikmət məşhunil-ərvahi-cünudi məcənnədə təarifi-minha etmədən və “Ma təkərrümiha” ixtilafi-dəlalət ilə xəl`əti-xilqəti-işbah geymədən rəqabeyi-zənciri-məhəbbət çəkmişlər və riyazi-vücudi-bəşəriyyədə və “həmələhul-insanü innəhu kanə zəlumən

[17] Azərbaycan hekayələri. Bakı, 1958, səh. 464.
[18] Yenə orada, səh 464.
[19] Yenə orada, səh.464.

cəhulan" misdaqincə nihali-möhnət əkmişlər"[20]. Hekayənin bu hissəsi M.Mübariz tərəfindən belə sadələşdirilmişdir: "Sonra bu məhəbbət zəncirinə bağlanıb, möhnət zindanının giriftarı, qəm torunun əsiri, kədər və qüssə tapdağı, müsibət bağının bülbülü, yəni halı pərişan Qüdsi belə bir qəlbəyatan tərzdə könül sahiblərinə əhvalatı bəyan etmiş və belə bir zövq artıran şiyvə ilə bəsirət əhlinin könül lövhəsinə qələm yürütmüşdür ki, insan övladı, hələ xilqət xələtini geymədən, "Mən onu əziz yaratdım" kimi hikmətli ifadənin məzmununa uyğun olaraq məhəbbət zəncirinin halqaları ilə bağlanmış və bəşər vücudunun əzab və işgəncələr üçün yarandığı haqqındakı ayənin təsdiqi olaraq daima qəm və qüssə ilə yaşamışdır"[21] . Hekayənin bu parçası tərəfimizdən müasir dilimizə belə uyğunlaşdırılır: "...Əmma sonra möhnət silsiləsinin əsiri və məhəbbət zindanının dustağı

Fərd:

dərd həbsxanasına bağlanmış, qəm-qüssədən üzülmüş
möhnət bağının bülbülü, pərişan hallı Qüdsi

bu incə üslubla ağıl sahibləri dəstəsinə gizli məqsədlərini bəyan etmiş və bəsirət sahiblərinin ürəklərinin lövhələrinə bu ləzzətli üslubla nişanələr qələmini yürütdüyü hikmətin məzmunu budur ki, ruhlarla doldurulmuş ordu timsalında Onu tanımadan və "O şey ki onu kərəm sahibi edir" sübutunun ixtilafı ilə insan övladları yaradılış sirrinin xələtini geymədən məhəbbət zəncirinin əziyyətini çəkmişlər və bəşəriyyət vücudunun bağında və "insan həqiqətən də çox cahildir"[22] misalınca sıxıntı pöhrələrini əkmişlər".

M.Mübariz hekayənin tərcüməsində daha bir mühüm sayıla biləcək səhvə yol vermişdir. A.Bakıxanov yazırdı: "Və atan övsafini bəyan etdiyindən madəri-mehribanım dəxi ona

[20] Abbasqulu ağa Bakıxanov. Seçilmiş əsərləri. Bakı, 1984, səh. 121.
[21] Azərbaycan hekayələri. Səh. 55.
[22] "...Qna insan yükləndi. Həqiqətən, o, (insan) çox zalım və cahildir."

təəşşüq yetirmiş"[23]. M.Mübariz hekayəni müasir dilimizə belə uyğunlaşdırırdı: "Onu da deməliyəm ki, mən sənin atanı o qədər tərifləmişəm ki, mənim mehriban anam da görmədən ona vurulmuşdur"[24]. Halbuki cümlə belə bir məna ifadə edir: "Və atan tərifini bəyan etdiyindən mehriban anam dəxi ona aşiq olmuşdur". Hekayənin məzmununun təhrifinə yol açan daha bir səhvi qeyd etməmək mümükün deyil. A.Bakıxanov yazırdı: "Bir kimsə əgər bir səbiyyəni həbaleyi-nikahə gətirsə, validi-mənkuhə validəsindən təməttöi-təzvic almaq caizdirmi?"[25] M.Mübariz belə ifadə edirdi: "Əgər bir şəxs bir qızla evlənə, onun atası həmən qızın anası ilə evlənmək ixtiyarına malikdirmi?"[26] Cümlə isə bu mənanı ifadə edir: "Bir kimsə əgər bir həddi-büluğa çatmamış qızı nikah yaşına çatdırsa, qəfildən nikahlı atasının qızın anasını nikaha gətirməsi caizmidir?" M.Mübarizin ifadəsində bu kimi mühüm xətalardan başqa bir sıra üslub xətaları da vardır ki, əsərin ekspressiv təsirini orijinaldan xeyli uzağa salır. Hekayə 1958-ci ildə sadələşdirilərək çap olunsa da, elmi ictimaiyyətin diqqətindən kənarda qalmış, bu istiqamətdə işləyən tədqiqatçılar tərəfindən dəyərləndirilməmişdir.

"Kitabi-Əsgəriyyə" əsərini bir çox istiqamətlərdə öyrənən alim bədii nəsrimizin əsas tədqiqatçılarından sayılan Hidayət Əfəndiyev olmuşdur. H.Əfəndiyev A.Bakıxanovun ədəbi-bədii əsərlərini tədqiqata çəkərək Azərbaycanda "yeni üslublu, müasir, maarifçi-realist və satirik ədəbiyyatımızın təşəkkül və inkişafını onun adı ilə" bağlayır. Abbasqulu Ağa Bakıxanovu XIX əsr Azərbaycan bədii nəsrinin banilərindən biri hesab edir. "Kitabi-Əsgəriyyə"nin yazılması səbəbini isə aşağıdakı kimi açıqlayır: "Bakıxanov öz yaradıcılığında bu

---

23 Abbasqulu ağa Bakıxanov. Seçilmiş əsərləri. Bakı, 1898, səh. 129.
24 Azərbaycan hekayələri. Səh.65.
25 Abbasqulu ağa Bakıxanov. Seçilmiş əsərləri. Bakı, 1989, səh. 130.
26 Azərbaycan hekayələri.Səh. 65.

janra təsadüfi olaraq müraciət etməmişdir. Zəngin erudisiyalı, geniş məlumatlı böyük maarifpərvərin bu dövrdə istər rus yazıçıları və istərsə Avropa nasirləri tərəfindən yazılmış mühüm əsərləri – roman, povest, hekayə və novellaları oxumasına heç şübhə ola bilməz" [27] . Hekayənin problematikasının aktuallığı və onun həlli üsulundakı realizmi , süjetin dramatizmi, satirik-yumoristik üslubu tədqiqatçının mülahizələrinə haqq qazandırır. Bundan əlavə, yazıçının "Gülüstani- İrəm" əsərinin son səhifələrinə əlavə etdiyi hal tərcüməsində özü haqqında verdiyi məlumatlar da bu fikirləri bir daha təsdiq edir: "Qafqaz nahiyəsinin hərbi sərkərdəsi general Yermolov 1235-ci hicri – 1820-ci məsihi tarixində məni hüzuruna Tiflisə dəvət edib, dövləti bir xidmət mənə təklif etdi. Tiflisdə sakin olarkən rus dilini öyrənməyə sə`yü-həvəs etdim və bu dilin köməyi ilə Avropa mədəniyyətinə filcümlə bələd oldum.

Daima böyük adamların və sərkərdələrin yanında olduğumdan Şirvan, Ermənistan, Dağıstan, Çərkəzistan, Gürcüstan, Anadolu və Azərbaycan vilayətlərini gəzib, kamalınca o yerlərə bələd və aşina oldum.

Hər vilayətə qədəm qoycaq oranın əhval, övzavü məkanına və əhalinin tərzi-məaşına diqqət yetirdiyim kimi, ürəfa, üqəla və hükəması ilə də görüşüb yaxınlaşmağa da müvəffəq oldum.

Türkiyə və İran müharibələrində - ki, hicrətin 1248-ci və miladın 1833-cü tarixində vaqe olmuşdu, - mən knyaz Paskeviçin hüzurunda sahibmənsəblər dairəsinə daxil oldum.

Bütün Qafqaz sərhədini, Don nəhrinin səvahilini, Malorossiya, Liflyandiya, Litfa, Lehistan ölkələrini səyahət etdim. Buralarda həm dövlət başında məqam və mənsəb sahibi

[27] Hidayət Əfəndiyev. Azərbaycan bədii nəsri tarixi.Bakı, 1964, səh. 86

olan kəslər ilə və həm elm və mərifət sahibləri ilə tanışlıq və dostluq etməklə bəxtiyar olmuşam"[28].

Bakıxanov öz dünyagörüşünün qaynağı haqqında danışdıqdan sonra qələmə aldığı əsərlərin yazılma səbəbi ilə də oxucularını məlumatlandırırdı: "Bu səyahətimdə ağıla və ruha qəza və pərvəriş verici bir çox şeyləri görüb onları əxz etməyə səy və himmət sərf etmişəm. Bəşəriyyətin övzavü əhvalına dürüst mültəfit olub özümə yəqin etdim ki, bu dünya dari-fənadır, bir şey yoxdur ki, bunda daimi və əbədi olsun. Ad və şöhrət puçdur. Dövlət və mənsəb müdam bir qərar üzrə qalmaz. Nə qədər nəcib və məşhur bir silsilədən olursan, ol, vəqti ki, özündə layiqi-etina bir şey yoxdur, xalq nəzərində qədrü qiymətini itirmiş olursan. Ancaq bir şeyə etiqadım dürüst və inanmağım möhkəmdir, o da budur: Ülum və fünun aləmində bir mərifət və məharət qazanar isən, lazımınca bilik hasil edib özündən sonra gələnlərə öz elm və biliyindən bir səmər və əsər qoyar isən, ol vaxt özünü xoşbəxt hesab etməyə haqqın olar; dari-üqbayə rehlət edəndən sonra bu dünyada yenə yaşamış kimi olursan. Belə bir əqidədə olduğumdan və bu əqidəni sevdiyimdəndir ki, ona xidmət etməyi özümə vacib bilib bir neçə əsərləri qələmə almağa cəsarət etmişəm"[29].

Bakıxanov bu təfərrüatın ardınca o zamana qədər yazdığı əsərlərinin də siyahısını əlavə edirdi. Bir daha qənaətimiz təsdiq olunur ki, hekayə yazıçının püxtələşmiş qələmindən çıxmış və son nəticədə nail olduğu geniş dünyagörüşünün məhsuludur. Yazıçı digər ölkə və xalqların mədəniyyəti, adət-ənənəsi, elmi və ədəbiyyatı ilə ətraflı tanış olaraq yaşadığı mühitin problemlərini, cəmiyyətin davranış və rəftarının əsaslarını məhz bu dünyagörüşün süzgəcindən

---

[28] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. II cilddə, I cild, Bakı, 1978, səh. 290-291.
[29] Yenə orada, səh. 291.

keçirərək ədəbiyyat tariximiz üçün belə bir mühim və mütərəqqi addım atmışdır.

Hidayət Əfəndiyev "Kitabi-Əsgəriyyə" əsərinin yazıçının yeganə bədii nəsr nümunəsinin olmadığı fikrini irəli sürərək yazırdı: " Bədii nəsr janrında Bakıxanov Azərbaycan dilində iki əsər yazmışdır ki, bunlardan biri "Ryazül-Qüds", digəri isə "Kitabi-Əsgəriyyə"dir". H.Əfəndiyev "Riyazül-Qüds" əsərinin yazılması tarixini təxminən 1820-1821-ci illərə aid edir. "Riyazül-Qüds" Füzulinin "Hədiqətüs-süəda"sı kimi olub Azərçaycan türkcəsində yazılmışdır. Kərbəla hadisələrinə həsr edilmişdir. Romantik üslubda dördüncü xəlifə Həzrət Əlinin oğlu Həzrət Hüseynin faciəsini təsvir edir. "Riyazül-Qüds" on dörd fəsildən ibarətdir. Hər fəsildə bir hadisədən danışılır, fəsillər müstəqil novella şəklində verilmişdir. Bu novellalar ilk baxışda bitkin, tamamlanmış bir əhvalat kimi nəzərə çarpsalar da, kompozisiya etibarı ilə bir-biri ilə möhkəm bağlı olub bir-birini tamamlayır.

H.Əfəndiyev "Riyazül-Qüds" əsərinə Füzuli üslubunun dərin təsirini qeyd edərək yazırdı: "Riyazül-Qüds"də Füzuli üslubunun, Füzuli dilinin və bədii xüsusiyyətlərinin dərin təsiri özünü göstərməkdədir. "Riyazül-Qüds"ü hətta Füzulinin "Hədiqətüs-süəda"sına nəzirə adlandırmaq olar"[30].

H.Əfəndiyevin tədqiqatı "Kitabi-Əsgəriyyə" hekayəsinin nəşri və öyrənilməsi tarixini faktoloji məlumatlarla zənginləşdirməsi baxımından da qiymətlidir. "Qəvaidi-Zöviyyə" adlı kitabda əsərin bəzi yerlərini ixtisarla və sadələşdirilərək verildiyini buradan da öyrənirik. Daha maraqlı faktlardan biri də budur ki, Quba şəhərində Ərdəbillilər məscidindən tapılıb Nizami adına Ədəbiyyat və Dil İnstitutunun Əlyazmaları fondunda saxlanılan nüsxənin mükəmməl tənqidi mətni ilk dəfə 1946-cı ildə institutun əsərlərinin birinci cildində nəşr olunmuşdur. H.Əfəndiyev

[30] Hidayət Əfəndiyev. Azərbaycan bədii nəsri tarixi. Bakı, 1064, səh. 86

əsərin yazılma tarixini ədibin bədii yaradıcılıq fəaliyyətinin son dövrlərinə - 1837-ci ilə aid edir.

H.Əfəndiyev hekayənin ədəbiyyat tariximizdəki yerini və rolunu tamamilə doğru müəyyənləşdirmişdir: “Kitabi-Əsgəriyyə” əsərilə Bakıxanov birinci olaraq köhnə ənənələrin xaricinə çıxmış, yeni dövrün, yeni ədəbi üslubun nümayəndəsi kimi, yeni tipli bir yazıçı kimi çıxış etmişdir. “Kitabi-Əsgəriyyə” – XIX əsr Azərbaycan ədəbiyyatında ilk nəsr əsərlərindəndir. Azərbaycan ədəbiyyatı Bakıxanovadək nəsrdə yazılmış nə bir romana, nə də bir hekayəyə malik olmuşdur”[31]. H.Əfəndiyev Bakıxanovun novatorluğunu forma novatorluğu deyil, haqlı olaraq məzmun və ideya novatorluğu hesab edir. O, “Kitabi-Əsgəriyyə” əsərini doğru olaraq çürük ənənələrə, qəbih adətlərə qarşı çıxan maraqlı bir hadisə kimi qiymətləndirsə də, mövcud siyasi rejimin idealogiyasının təsiri ilə və həqiqətin məhdud imkanları daxilində bu çirkinliklərin, cəhalətin mənbəyi kimi İslam dininin qanunlarını görürdü. Elə bu cəhətdən də tədqiqatında əsərin ideya istiqamətinin müəyyənləşdirilməsində əsaslı yanlışlıqlara yol verilmişdir. Lakin bunlara baxmayaraq, hekayənin ədəbiyyat tariximiz üçün əhəmiyyətindən danışarkən Hidayət Əfəndiyevin araşdırmasını samballı bir əsər kimi qiymətləndirməliyik: “...Bakıxanovun belə cəsarətli bir tələblə çıxış etməsi xüsusi bir əhəmiyyətə malik idi”[32]; “Abbasqulu Ağa Bakıxanovun “Kitabi-Əsgəriyyə” hekayəsi, istər yeni və mütərəqqi ideya təbliğ etməsi və istərsə öz dövründəki həyat və məişət hadisələrini realistcəsinə əks etdirməsi cəhətdən çox qiymətlidir. Bu əsər – dövrünün məşhur alimi, böyük maarifçisi, zəkalı şairi olan Bakıxanova eyni zamanda yeni

---

[31] Hidayət Əfəndiyev. Azərbaycan bədii nəsri tarixi. Bakı, 1964, səh.86
[32] Yenə orada, səh. 87

Azərbaycan nəsrinin görkəmli nümayəndəsi adını qazandırmışdır"[33].

Abbasqulu Ağa Bakıxanovun bütün bədii əsərləri ilk dəfə 1984-cü ildə Məmmədağa Sultanovun tərtibatı və tərcüməçiliyi ilə çap olmunmuşdur. Məmmədağa Sultanov "Kitabi-Əsgəriyyə" əsərinin Azərbaycan ədəbiyyatı tarixində ilk povest adlandıra bilmə ehtimalını irəli sürür. Həmçinin onun İsmayıl bəy Qutqaşınlının "Rəşid bəy və Səadət xanım" (1835) hekayəsindən əvvəl yazıldığını güman edərək A.Bakıxanovu müasir bədii nəsrimizin banisi kimi görür. Altay Məmmədov ədəbiyyatşünaslığımızda artıq bu fikrin ardıcıllıq qazandığını görüb əsərin "janrını qəti müəyyənləşdirmək" ehtiyacını hiss edir. Lakin əsərin səthi öyrənilməsi və zahiri lirik cazibəsi onu yanlış mühakimələrə sövq edir ki, bununla da tədqiqatçı hekayə haqqında bütün müddəalarında səhv nəticəyə varır:

1. "Kitabi-Əsgəriyyə" çox vaxt lirik- epik janr kimi qiymətləndirilən poemaya daha çox yaxındır. Daha doğrusu, şeir və nəsrlə yazılmış lirik məhəbbət poemasıdır"[34].

2. "Kitabi-Əsgəriyyə" bir bədii əsər kimi XX əsr realist Azərbaycan hekayəsi ilə nə şəkli, nə də məzmun və quruluş cəhətdən əlaqədar deyildir"[35].

3. "...qəliz ibarələr, fars və ərəb tərkibləri ilə dolmuş.., səclərlə yazılmış" nəsr hissəsinə görə Bakıxanovu Azərbaycanda müasir nəsrin banisi" hesab etmək olmaz"[36].

Əsərin "poema" adlandırılmasına etiraz olaraq deyə bilərik ki, hekayənin çətin anlaşılan dilinin onun inkar fonunun və satirik-yumoristik üslubunun müəyyənləşdirilmə-

[33] Hidayət Əfəndiyev. Azərbaycan bədii nəsri tarixi. Bakı, 1964, səh. 107
[34] Altay Məmmədov. Azərbaycan hekayəsi. Bakı, 1984, səh. 8.
[35] Yenə orada, səh. 8.
[36] Yenə orada, səh. 9.

sinə imkan verməməsindən tədqiqatçı lirik intonasiyanın torundan çıxa bilməmişdir.

İkincisi, hekayədə təsvir olunan hadisənin realist inkişaf xətti, tənqid subyektləri (mərsiyəxanlıq, qeybətcil və araqarışdıran cahil insanlar, səriştəsiz məhəllə rəisi, fırıldaqçı "fazili-fərzanə və yeganeyi-dövrü zəmanə", mənfəətpərəst "valid və validə"), təsvir olunan mövcud mühitdəki ənənənin yaratdığı bataqlığın ifşası, bədii qəhramanın ətrafında sıx hörülmüş müşküllərin real zəmində və mühitin öz mübarizə üsullarıyla (hiylə, qarğış, and, mövhumat) çözümünə cəhdləri, xronotopun dəqiqliyi (yazıçının yaşadığı dövr, Novruz bayramı ərəfəsi, Quba şəhərinin girişində birinci məhəllə - "ərdəbillilər" məhəlləsi) və s. xüsusiyyətləri onu M.F.Axundov realızmi və hətta XX əsr Azərbaycan hekayəsi ilə möhkəm bağlarla bağlayır.

Üçüncü müddəaya gəlincə, tədqiqatçının bu hökmü Azərbaycan ədəbi dilinin formalaşmamasının real səbəbləri diqqətdən kənara qoyularaq Bakıxanova açıq haqsızlıq kimi səslənir.

Nadir Məmmədov da Altay Məmmədovun fikirlərinə, demək olar ki, tamamilə şərik görünür. Doğrudur, A.Məmmədovdan fərqli olaraq o, "Kitabi-Əsgəriyyə" hekayə-sinin "bu janrın tələblərinə cavab verən ilk bədii nəsr əsəri yaradılması cəhdi" kimi qiymətləndirirsə də, yenə də yalnız bir cəhd olaraq qaldığını, "sözün həqiqi mənasında hətta bir nəsr əsəri olmamasını" sübut etməyə çalışmışdır. N. Məmmədov da bir sıra birtərəfli və bəzən də tamamilə yanlış müddəalarla çıxış edir:

1."Kitabi-Əsgəriyyə"də XIX əsrin birinci otuzilliyində Azərbaycan həqiqətləri, bu xalqın milli xüsusiyyətləri öz realist əksini tapmamışdır".[37]

[37] Nadir Məmmədov. M.F.Axundovun realizmi.. Bakı, 198, səh.204

2. "Kitabi-Əsgəriyyə" bütövlükdə Şərqin məşhur mücərrəd-romantik və dini-mistik poemalarının açıq təsiri ilə yazılmışdır".[38]

3. "Kitabi-Əsgəriyyə"nin bədii əsər kimi qiymətləndirilməsində və Azərbaycan nəsri tarixində yerinin müəyyənləşdirilməsində bir sıra tədqiqatçılar tərəfindən açıq mübaliğələrə yol verilmişdir. [39] Bu ittiham isə "Kitabi-Əsgəriyyə"nin ən obyektiv tədqiqatçılarından biri olan Hidayət Əfəndiyevə yönəldilmişdir.

Azərbaycan bədii nəsrinin tədqiqatçılarından olan Əflatun Saraclı Azərbaycan ədəbiyyatşünaslığında ənənəvi nəsr janrlarının təkamülü tarixində ilk hekayə nümunələrinin yerini və rolunu müəyyənləşdirərək yazırdı: "Azərbaycan ədəbiyyatında XIX əsrə qədər Füzulinin "Şikayətnamə" (XVI əsr), Xaçmazinin "Dözd və qazi" (XVIII əsr) kimi tək-tək hekayə nümunələrinə rast gəlsək də, bütövlükdə bədii nəsrin təkamülü və inkişafı XIX əsrdən başlanır. Əsrin 30-cu illərindən başlayaraq İ.Qutqaşınlının "Rəşid bəy və Səadət xanım" (1835), A.Bakıxanovun "Kitabi-Əsgəriyyə" (1837), M.F.Axundovun "Aldanmış kəvakib" (1857), "Kəmalüddövlə məktubları" kimi lirik və satirik hekayə, povest və məktub-traktat meydana çıxdı" [40] . Müəllif "Kitabi-Əsgəriyyə"ni özündən əvvəlki hekayə nümunələri kimi "klassik ədəbiyyatımızdakı məhəbbət mövzusunun nəsrdə davamı" adlandıraraq yeniliklərini görə bilməmişdir. Əflatun Saraclının da qeyd etdiyi kimi, "Kitabi-Əsgəriyyə" hekayəsinin 1837-ci ildə yazılma ehtimalını ilk dəfə Hidayət Əfəndiyevin tədqiqatında görürüksə də, müəllif faktın sübutuna çalışmadığından etibarlı mənbə yerinə keçirə bilmir.

Vəli Həbiboğlunun "Abbasqulu Ağa Bakıxanov" əsəri "Kitabi-Əsgəriyyə" əsərinin yazılma səbəbi və tarixi haqqında

---

[38] Nadir Məmmədov. M.F.Axundovun realizmi.. Bakı, 198, səh.204
[39] Yenə orada, səh 204
[40] Əflatun Məmmədov. Azərbaycan bədii nəsri. Bakı, 1983, səh. 16.

maraqlı faktları üzə çıxarması baxımından əvvəlki tədqiqatlardan bir qədər fərqlənir. Tədqiqatçıya görə, "Kitabi-Əsgəriyyə" hekayəsi yazıçının erkən yaradıcılıq dövründə Dərbəndin nüfuzlu din xadimlərindən biri olan Məhəmməd Tağı ibn Məhəmməd Qasımın "Kitabi-Zərbəli" hekayəsinin təsiri ilə yazılmışdır: Abbasqulu Ağa Bakıxanov dövrünün bir çox nüfuzlu üləmaları ilə də əlaqə saxlayırdı. O, bu üləmaların simasında xalqı mərifətə, düzlüyə, paklığa çağıran, şər işlərdən uzaqlaşdıran ağıl idrak sahiblərini görürdü. Bu cəhətdən onun Məhəmməd Tağı ibn Məhəmməd Qasım ilə əlaqəsi çox səciyyəvi əhəmiyyət daşıyır. General A.P.Yermolov onun Şıxəli xanla əlaqə saxlamasından şübhələnirdi və onu cəzalandırmaq niyyətində idi. Bu məqsədlə də Dərbənd komendantına məktub yazıb Məhəmməd Tağının cəzalandırılmasını tələb etmişdi. Lakin heç nədən xəbəri olmayan Məhəmməd Tağı məhkəmədə özünə bəraət qazandıra bilmişdi. Buna baxmayaraq, bir neçə ildən sonra Qafqaz canişini onu "xəyanət göstərdiyinə görə" dörd il öz doğma yurd-yuvasından sürgün elətdirmişdi. Məhəmməd Tağı 1820-ci ildə bir növ başına gələn əhvalatın təsiri altında Azərbaycan dilində "Kitabi-Zərbəli" adlı əsərini yazmışdı. Həmin əsərin ilk oxucularından biri də Abbasqulu Ağa Bakıxanov olmuşdur. Sonra böyük mütəfəkkir "Kitabi-Əsgəriyyə" əsərini məhz bu kitabın təsiri altında yazmışdır[41].

Vəli Həbiboğlu hekayənin Bakıxanovun erkən yaradıcılıq dövrünə aid olması fikrini bununla əlaqələndirir ki, "Məhəmməd Tağının məlum əsərinin təsiri altında yazılan, qələmə alınan mövzu on il fasilədən sonra meydana çıxa bilməzdi. Yəni A.A.Bakıxanov 1820-ci ildə oxuduğu "Kitabi-Zərbəli" əsərindən sonra belə bir mövzuya müraciət etməyi qarşısına məqsəd qoymuşdu". Lakin tədqiqatçının iddiası ilə razılaşmamaq üçün də əlimizdə əsas vardır. Əgər qeyd edildiyi kimi , hekayə 1820-ci illərdə yazılmış olsaydı, onun adı da

[41] Vəli Həbiboğlu. Abbasqulu ağa Bakıxanov. Bakı, 1992, səh. 156.

yazıçının "Gülüstani-İrəm" əsərində verdiyi əsərlərinin siyahısına düşmək imkanı qazanardı.

Vəli Həbiboğlu da özündən əvvəlki bir çox tədqiqatçılar kimi, əsərin konflikti kimi "İslam dininin, şəriətin qoyduğu adət və ənənəni" görür və bununla da mövzunun doğru yozumuna nail ola bilmir.

Tədqiqatçı alim "Kitabi-Əsgəriyyə" əsərinin yazılmasının mühüm əhəmiyyətini onda görür ki, "bu əsər özündən sonra yaranmış bir çox nəsr nümunələrinin meydana çıxmasına təsir göstərə bilmişdir"[42]. Hekayənin Azərbaycan ədəbi mühitində kütləvilik qazanmasını sübut edən dəlillərin əldə olmamasını nəzərə alaraq təsirindən danışmağa imkanımız olmasa da, onun ilk nəsr əsərlərinin yaradıcılarından olan İsmayıl bəy Qutqaşınlı və Mirzə Fətəli Axundovla əlaqələrinə əsasən bu təsiri ehtimal edə bilmək imkanı qazanırıq.

Müasir ədəbiyyatşünaslığımızda Zaman Əsgərli Abbasqulu Ağa Bakıxanovun bədii nəsr yaradıcılığı sahəsindəki fəaliyyətini yüksək qiymətləndirərək xüsusən onun "Riyazül-Qüds"ünə böyük əhəmiyyət verir: " Xalis Şərq-Füzuli ənənələri əsasında yaranan klassik nəsrin zirvəsində məşhur şair, alim və ictimai xadim Abbasqulu Ağa Bakıxanovun "Riyazül-qüds"(1820) əsəri dayanır. Dahi Füzulinin "Hədiqətüs-süəda" əsərinin ədəbi təsiri və Məhəmməd Bağır Məclisinin "Cilaül-üyun" ("Gözlərin işığı") kitabından sərbəst faydalanma yolu ilə yazılan bu roman-dastanda Kərbəla hadisələri, İmam Hüseynin başına gətirilən müsibətlər təsvir olunur. Yazıçı böyük məhəbbətlə canlandırdığı surətlərin, xüsusilə, əsərin baş qəhrəmanının əsasında əqidə uğrunda mübarizədə yolundan dönməyib şəhid olan ideal bir şəxsiyyət surəti yaratmış, onu dərin bir məhəbbətlə müqəddəsləşdirmişdir"[43].

---

[42] Vəli Həbiboğlu. Abbasqulu ağa Bakıxanov. Bakı, 1992, səh. 159.
[43] Azərbaycan nəsri antologiyasış/Ön söz..Bakı, 2006, səh.4

Zaman Əsgərli əsərin süjetini təşkil edən hadisələrin təsvirindən doğan qəm-kədərin təsirini qeyd etsə də, Bakıxanovun bütün bədii yaradıcılığı üçün səciyyəvi olan bir xüsusiyyəti vurğulayır ki, " bu kədər bədbinliyə, ümidsizliyə səsləmir, əksinə dünyadakı ictimai haqsızlığa möhkəm, ciddi etirazın forması kimi çıxış edir"[44].

Zaman Əsgərli "Kitabi-Əsgəriyyə" əsərini isə XIX əsr ədəbiyyatında yeni bir hadisə kimi qiymətləndirir: "Mövzusu İslami-Şərq tarixindən alınmış "Riyazül-Qüds"dən fərqli olaraq ədibin "Kitabi-Əsgəriyyə" hekayəsində mövcud cəmiyyətdə baş verən hadisələr təsvir olunur". Tədqiqatçı alim "Kitabi-Əsgəriyyə" hekayəsinin konfliktini maarifçilik dünyagörüşünə uyğun görüb "köhnəlmiş adət-ənənələrə, bütövlükdə mənəvi əsarətə qarşı" çıxış etməsi fikrini müdafiə etməklə bir daha hekayənin real zəmində yazıldığını təsdiqləmiş olur. Z.Əsgərli hekayənin "maatifçi yazıçıların əsərlərində tez-tez təsadüf olunan "xoşbəxt sonluqla" bitməsini və bu sonluğun "ədibin irəli sürdüyü ideyanın qabarıq ifadəsinə çevrilərək, sağlam ağlın, mənəvi-əxlaqi təmizliyin, sədaqət və doğruluğun avamlıq, cəhalət, böhtan, əqli-naqislik və eybəcərlik üzərində təntənəsi kimi" mənalandırsa da, əsərin konfliktinin real zəmində həllinin mümkünə çevrilə bilmədiyi onun mövhumi sonluğu ilə tamamilə aydın görünür.

"Kitabi-Əsgəriyyə" hekayəsi bu günə qədər sirrini qoruyub saxladığına görə hələ də öyrənilməyə ehtiyacı duyurmaqdadır. Görkəmli ədəbiyyatşünas Yaşar Qarayevin "nisbətən realist əsər"[45] kimi dəyərləndirdiyi əsərin yenidən tədqiqata cəlb edilmə zərurətini Tahirə Məmməd belə ifadə edir: "Q.Yaşarın maarifçi ədəbiyyat nöqteyi-nəzərindən dəyərləndirdiyi əsərlərə tədqiqatda istinad olunmadığından həmin əsərlərin mətninə yenidən nəzər salmağa ehtiyac var.

---

[44] Azərbaycan nəsri antologiyası. Ön söz..Bakı, 2006, səh.6
[45] Qarayev Y. Realizm: sənət və həqiqət. Elm, Bakı, 1990, səh.57

Tədqiqatçı alim “Kitabi-Əsgəriyyə”ni dajha çox realist hekayə hesab edir, lakin əsərin realistliyi nədədir, onu göstərmir. Əsərin daha çox ənənəvi keyfiyyətləri üzərində dayanır”[46]. Tahirə Məmmədin isə qənati bundan ibarətdir ki, “Kitabi-Əsgəriyyə” bizə realist hekayədən daha artıq bir eşq macərasını anladacaq böyük əsərin qısa eskizi təsirini bağışlayır”[47].

Hekayə janrının qarşısına qoyulan tələblərə və bu janrın ədəbi dövriyyəyə daxil olma tarixi məqamına görə “Kitabi-Əsgəriyyə” əsərini Azərbaycan bədii təfəkküründə ilk lirik-psixoloji momentlərlə zəngin satirik-yumoristik hekayə adlandıra bilərik. Hekayənin süjetini klassik ədəbi mövzularla XX əsr bədii irsinin tematikası arasında körpü kimi görürük. Fikrin qidalandığı mənbə Füzuli dühasıdır. Bakıxanovun təhkiyəsi “Şikayətnamə”nin dili və üslubu , ekspressiv təsiri isə “Leyli və Məcnun”un lirik tərənnümləri əsasında yaranmışdır. Əsərin obrazlarından biri – ustad mərsiyəxan isə ədəbiyyat tariximizin irəli səhifələrində daha obyektiv simasını qazanmış Yusif Vəzirin, Mirzə Cəlilin “mərsiyəxanlarının” sələfidir.

“Kitabi-Əsgəriyyə” hekayəsi ilə bağlı bir çox mühüm tədqiqatları nəzərdən keçirdikdə dəyərli və obyektiv fikirlərin söyləndiyinin şahidi olduq. Lakin bununla belə, əsərin janrının müəyyənləşdirilməsi kimi digər bir sıra mübahisələrin həll edilmədən qaldığı da diqqətimizdən yayınmadı.

“Kitabi-Əsgəriyyə” əsərinin yazılma tarixi məlum olmadığından bir sıra tədqiqatlarda irəli sürülmüş ehtimallar hələ fakt yerinə keçə bilmir. V.Həbiboğluna görə, hekyənin yazılma tarixi XIX əsrin 20-ci illəri kimi güman edilsə[48] də, inam doğurmur. Əsərin məzmunu və ideyası yazıçının geniş dünyagörüşünün məhsulu olması qənaətinə gəlməyimizə imkan

---

[46] Tahirə Məmməd. XIX əsr Azərbaycan ədəbiyyatı. I hissə. Bakı, 2010, səh. 48

[47] Yenə orada, səh. 48

[48] Vəli Həbiboğlu. Abbasqulu ağa Bakıxanov. Bakı, 1992, səh. 156.

verir. Buna görə də hekayənin müəllifin yaradıcılığının ilk dövrlərinə deyil, daha çox son dövrlərinə aid edə bilərik. H.Əfəndiyevin ehtimalına görə, göstərilən 1837-ci il tarixini də sübut etmək mümkün deyildir. Maraq doğuran xüsuslardan biri budur ki, A.Bakıxanovun 1944-cü ildə yazdığı "Gülüstani-İrəm" əsərində müəllifin öz əsərlərinin haqqında məlumat verdiyi siyahıda "Kitabi-Əsgəriyyə"nin adı yoxdur. Dövrü üçün belə əhəmiyyətli əsərin yazıçının diqqətindən kənarda qalmağını heç bir əsasla güman edə bilmərik. Bu tutarlı motivdən çıxış edərək hekayənin yazılma tarixinin dəqiqləşdirilməsi məsələsini sadə ehtimallarla və gümanlarla həll edilməsini məqbul hesab etmək olmaz..

"Kitabi-Əsgəriyyə" hekayəsinin əlyazmasını görmüş ədəbiyyatşünasların qarşısında onun yazılma tarixini müəyyənləşdirmək kimi mühim məsələ dururdu ki, bunun da bir sıra yolları vardır: "Əsərin əlyazma nüsxələrində köçürülmə tarixinin qeyd edilməsi digər tarixlərin müəyyənləşdirilməsini daha da asanlaşdırır. Adətən, katib və ya xəttat əsərin mətnini yazıb başa çatdırdıqdan sonra, ...ona sonluq yazır və həmin sonluqda nüsxənin köçürülmə tarixini müxtəlif üsullarla qeyd edir. Belə bir sonluq olmadıqda onun köçürülmə tarixi əlyazma nüsxəsinin müxtəlif yerlərində, o cümlədən, əlyazmanın titul vərəqində, mətnin haşiyələrində də qeyd edilə bilər" [49] . Bunlardan əlavə, "Kitabi-Əsgəriyyə" hekayəsi ilə müəllifin "Riyazül-Qüds" əsərlərinin dil və üslub məsələlərini də müqayisəli şəkildə nəzərdən keçirməklə onlar arasındakı zaman fərqini müəyyənləşdirmək ehtimalını da nəzərdən qaçırmamalıyıq. Lakin hekayənin yazılması tarixi ilə bağlı göstərilən rəqəmlər heç bir elmi sübuta əsaslanmadığından

---

[49] Şərifli Kamandar. Mətnşünaslığın əsasları (Ali məktəblər üçün dərslik). Bakı, Nurlan, 2003, 186 c.

onlardan hər hansı birini fakt kimi qəbul etmək mümkünə çevrilmədi.

"Kitabi-Əsgəriyyə" hekayəsinin bədii xüsusiyyətlərinin təhlilində isə nəzərimizi çəkən mühim məsələlərdən biri budur ki, tədqiqatçıların içində yalnız Firidun bəy Köçərli əsərdəki gülüşün səsini eşidib onu "baməzə" adlandırmışdır. Daha dəqiq elmi qənaətlərə gəlmək məqsədi ilə hekayənin üslubunu qorumaq əsasında dilinin sadələşdirilərək müasir nəzəri fikrin süzgəcindən keçirilməsi artıq təxirolunmaz zərurətə çevrilmişdir.

# "KİTABİ-ƏSGƏRİYYƏ": MƏZMUNU , BƏDİİ XÜSUSİYYƏTLƏRİ, İDEYA-EKSPRESSİV TƏHLİLİ

Abbasqulu Ağa Bakıxanovun "Kitabi-Əsgəriyyə" hekayəsinin adından göründüyü kimi, bu, müəllifin əsərinə ad qoyması ilə yanaşı, həm də onun janrının müəyyənləşdirilməsi cəhdidir. "Kitabi-Dədə Qorqud" dastanından başqa ədəbiyyat tariximizə "Kitabi-Məhəmmədiyyə" (Məhəmməd Əfəndi Yazıçızadə, İstanbul, (1863), "Kitabi-Seyfəlmülk"(1887), "Kitabi-Qəhrəmannameyi-türki" (1911), "Kitabi-Rüstəmnameyi-türki", "Kitabi-Dədə Muxtar" (1913), "Kitabi-Muxtarnamə" kimi əsərlər də məlumdur. "Kitab" sözünün bir ədəbi termin olaraq epik növün irihəcmli əsərlərinin adlandırılması Qədim Yunan ədəbiyyatından məlumdur. "E.ə. II və ya I əsrdə yunan nəsrinin əsas janrı – roman formalaşmışdır. Roman termininin özü orta əsrlərdə meydana gəlmişdir. "Le conte roman" termini ilə latın dilində deyil, məhz Roma dilində sevgi süjetinə malik təhkiyəvi əsərlər adlandırılırdı. Sonralar bu söz birləşməsi ixtisar olunaraq yalnız "roman" sözü qaldı ki, bu da nitq hissəsi olaraq sifətə aid idi, lakin indi isim kimi çıxış edir. Qədim yunanlar isə öz romanlarını hekayə, rəvayət (loqoi) və yaxud sadəcə, kitab (bibloi) adlandırırdılar. Qədim yunan romanları dövrümüzə gəlib çatmamış, onlardan yalnız papirus üzərində yazılmış parçalar qorunub saxlanmışdır. Antik romanların süjetində ümumi cəhətlər müşahidə edilir: belə ki, onun bütün qəhrəmanları – sevgililər, aşiq və məşuqlar qeyri-adi gözəlliyə malikdirlər, onların ürəyində məhəbbət qəfil alovlanır, lakin gənclər ayrı salınır, onlar ya quldur dəstələrinin əlinə düşürlər, ya tiranlar onları ayırır, ya da bu ayrılıqlara ailə vəziyyətləri səbəb olur. Lakin ayrılıqda da sevgililər öz məhəbbətlərinə sadiqdirlər, onlar hər bir əziyyətə qatlaşırlar, lakin ürəklərinə xain çıxmırlar. Nəticədə sevgililər bir-birlərini tapırlar və nikahda birləşirlər.[50] Göründüyü kimi, çox qədim bir tarixə malik olan süjetin əsrlərlə yeni fabulada, müasir üslubda inkişafını müşahidə edirik ki, bunun da ən yaxşı izahını görkəmli ədəbiyyatşünas-kulturoloq

[50] Античная литература. Москва, 1963, стр.198-199

Əhməd bəy Ağayevin sözləri ilə verə bilərik: "Fəqət həyat bir külli-tamdır, ikiyə bölünməz.., Yenilik, əskilik yoxdur. Yalnız hər hansı zamanda müasirləşmək vardır. Müasirləşmək isə mazinin hal ilə imtizac etməsindən ibarətdir... İştə o zaman həyatın təcəllası olan ədəbiyyat da yolunu, istiqamətini bularaq təqlidçilikdən qurtarır."[51]

Hekayənin baş qəhrəmanının adı da müxtəlif məna çalarlarına görə diqqətəlayiqdir. Ərəb dilində daha çox "ən kiçik" mənasında işlənən "əsgər" sözü həm də "dil və ürək"[52] mənasını ifadə edir. Əsərin ekspozisiyasında Əsgərin cəmiyyətdə mövqeyi "ol cavani-suxtəcan həmişə rüəsi-mənabirdə və məcməi-əkabirdəvü əsağirdə mərsiyəxan" kimi səciyyələndirilir ki, burada da qəhrəmanın adı mövqe kimi çıxış etmiş olur. Bu xüsus da Əsgər kimi kiçiklərin cəmiyyətdəki halının ifadəsini müəllifin ideya istiqamətlərindən biri kimi başa düşməyimizə imkan yaradır. Diqqətimizi çəkən bir məqam bu məsələnin M.Fətəli Axundovun yaradıcılığında da öz əksini tapmasıdır. Zəhra Allahverdiyeva "M.F.Axundovun yaradıcılığında mərifət fəlsəfəsi" adlı məqaləsində yazır: "Mirzə Fətəli dünyagörüşü etibarilə elə bir ali məqama çatmışdı ki, cəmiyyətin zahiri və batini tərəflərini bir-birindən seçib ayıra bilirdi, zahiri dindarlıqla, riyakarlıqla – batini işıqlanma arasında əmələ gəlmiş fərqi aydın görürdü və Şərq xalqının XIX əsrdə düçar olduğu bəlaları aradan qaldırmağın yollarını maariflənmədə axtarırdı. O, qəflətdən, cəhalətdən qurtulmağı, batini oyanma, işıqlanma, tərəqqini – bəşəriyyətin nicat yolu hesab edirdi. Öz duyğularını bir təcnisində aşağıdakı kimi söyləyir:

Mənə ki, rəhm etməz o bağrı qarə,
Oxusan yüz ona hədis və ayə.

"Hekayəti-seyyid ələm Səlyani" əsərində aydın görünür ki, sənətkarın hədəfi işi-peşəsi olmayan müftəxorlar, xalqı aldadan yalançılar, cahil və savadsız zümrədir. Psixoloji təsir

---

[51] Kamal Talıbzadə.Tənqid və tənqidçilər. Bakı, Yazıçı, 1989, səh. 228
[52] Х.К.Баранов. Арабско-руский словарь. Москва, Издательство «Русский язык», 1977, стр.438.

vasitəsi olaraq yenə də elə zəngin İslam fəlsəfəsinin dəyərlərindən istifadə edir:

Tap bir mürşid, salma nəzər kövneynə,
Tərəqqi eylə, çat qabi-kövseynə.
Sən ünqasən, cismin də ki qəfəsdir,
Qəfəs içrə artıq qalmağın bəsdir!
Sən özünü bilmə bir cürmi-əsğər,
Gizlənibdir səndə aləmi-əkbər.

M.F.Axundzadə bu misralar vasitəsilə insanın bir ali zatda (substansiyada) birləşdiyini, bəşərin, hər bir insanın o dəryadan bir damla olduğunu, bir sözlə, insanın uca bir varlıq olaraq gözəl və dəyərli yaşamağa layiq olduğunu göstərir."[53] M.F.Axundovda təsəvvüf terminləri kimi işlənən "əsğər" və "əkbər" sözləri A.Bakıxanovun hekayəsinin səciyyəvi xüsusiyyətinin bir elementi kimi, cəmiyyətdə mövcud olan real təbəqələrin ifadəsi kimi çıxış edir. Əsgər – mərsiyəxanlar məclisinin ən kiçiyidir, ata və oğul münasibətində yanə də kiçik mövqeyindədir. M.F.Axundov da təsəvvüf termindən istifadə edərək insanın cəmiyyətdəki məhz bu mövqeyinə qarşı çıxmış olur. Yəni, cəmiyyətin kiçik hesab olunan bu nümayəndəsi, əslində, elə cəmiyyətin özü deməkdir.

"Əsgər" adının "Dil və ürəyin bir olmaq" ifadəsi isə öz mənasını hekayədə şeir parçasındakı "Göftarı fünuni-mehrə inkar" misrasında tapır. Əsgərin "Söhbətitinin məhəbbət fənninə inkar olması" özünü iki aspektdə göstərir. Birincisi, mərsiyəxan olmaqla Əsgər İslam şəhidlərinə olan "məhəbbətini" gəlir mənbəyinə çevirməlidir[54]. "Leyli"sinə olan məhəbbətinin

---

[53] Zəhra Allahverdiyeva. M.F.Axundzadə yaradıcılığında mərifət fəlsəfəsi ("Kəmalüddövlə məktubları" əsəri əsasında). / Filologiya məsələləri. N-7, Bakı, "Elm və təhsil", 2012.

[54] Hekayədə yazıçının üstüörtülü toxunduğu bu məsələ XIX əsr Azərbaycan ədəbiyyatı tarixinin irəli səhifələrində daha açıq şəkildə işıqlandırılır. Təkcə Seyid Əzim Şirvaninin yaradıcılığına nəzər salmaqla mövzunun aktuallığını təsəvvürümüzə gətirə bilərik. Tahirə Məmməd tamamilə doğru fikirləşərək yazır: "O, (S.Ə.Şirvani – K.Nəhmətova) özü savadlı bir ruhani idi və ruhanilik adına cəhalət yayanları da əsaslı şəkildə tənqid etməyi bacarırdı"(Tahirə Məmməd. XIX əsr Azərbaycan ədəbiyyatı. I hissə. Bakı,

2010, səh.110). S.Ə.Şirvani "Quba təziyədarları və xeyməni qarət edənlərə" əsərində bu barədə belə yazırdı:

Baş yarmağa, ox atmağuva hiç sözüm yox,
Bir siz təki yox sahibi-cürət, köpək oğlu!
Amma ki, bu iş mərifət ilə ola, xoşdur,
Biganə bizə etməyə töhmət, köpək oğlu!
Gözlər açılıb, iş dəyişib, haldır özgə,
Ancaq bizi tutmuş bu cəhalət, köpək oğlu!(Seyid Əzim Şirvani.Seçilmiş əsərləri.Bakı, 2005, səh. 35)

"Salyanlı Axund Molla Məhəmmədhəsən haqqında" şeiri də mərsiyəxanlığın yaratdığı problemlərin tənqidində ən tutarlı əsərlərindən biridir:

"Gördüm yuxuda şəhi-bəlanı,
Məzlumi-diyari-Kərbəlanı.
Qəmgin idi, əşk-rizvan,
Giryan eləyirdi masivanı.
Öpdüm ayağın təzərrö etdim –
Key, möhnəti ağladan səmanı!
Bais nədi göz yaşın rəvandır?
Şərh eylə mənə bu macəranı.
Bir ah çəkib buyurdu ol şəh,
Gör dəhrdə çəkdiyim cəfanı.
Yetmiş iki tən şəhid olduq,
Çəkdik ələmü qəmü bəlanı.
Bunlar hamı səhldir və lakin
İncitdi məni, görün, filani,
Bir mərsiyəxani-hərzə-göftar,
Minbərdə ipə düzür yalanı.
Ta ağlada bir neçə əvamı,
Bağlar bizə hərdəm iftiranı.
Sordum ki, o kimdir, ey mükərrəm?
Ver bircə nişan o qəltəbanı.
Bir ah çəkdi, dedi o sərvər:
Salyanın o zişt rövzəxanı.
Ol Molla Məhəmmədhəsən kim,
Satdı pula din ilə imanı".(Yenə orada, səh. 50)

Seyid Əzim Şirvaninin mərsiyəxanlıq haqqında ən maraqlı fikri isə "Məhəmmədtağı Qumri"yə qəsidəsində bir beytdə səslənir:

"Qəbul olsa əgər ki, matəmi-şahi-şəhidanə,
Deyil bir misrəi-əşarına aləm bəha, Qumri". (Yenə orada., səh.170)

Beyt bu mənanı ifadə edir ki, əgər şəhidlik şahının, yəni Həzrət Hüseynin matəmi qəbul olunarsa, sənin şeirinin bir misrası aləmə bərabər olar. Məlum olduğu kimi, Qurani-Kərimdə şəhidliklə bağlı qiymətli məlumat verilir:.

bəhrəsini isə doğru yolla qazana bilməyəndə  hiylə yolu ilə əldə etməyə çalışır.

"Kitabi-Əsgəriyyə" hekayəsi – müəllifin kiçik, lakin dərin mənalı müqəddiməsilə başlayır. Bu müqəddiməni də öz məzmununa görə iki hissəyə ayırmaq olar. Birinci hissə ərəbcə yazılmışdır. "Böyük olan Allaha həmd və səna, şükr və niyaz ilə" başlayaraq peyğəmbərin şəninə deyilmiş tərif sözləri ilə bitir: "Həmd olsun bir Allaha ki, qəlblər arasında ülfət yaratmış, onu camal parlaqlığı ilə işıqlandırmış və arzu edənlərin gözlərini ziyalandırmışdır. Böyük olan Allah deyir: "Nəfsin istəklərinə məhəbbət, qadınlara və uşaqlara sevgi... insanların gözündə gözəl göstərilmişdir"[55]. Məxluqatın ən şərəflisi Məhəmmədə və onun haqq yolda olan məsum

---

Şəhadət hər bir xalqın ən üstün və mənəvi dəyərlərindən biri sayılır. Hər bir millətin qüruru o millətin cavanlarının ölümdən qorxmaması və həmişə din, namus və ölkəsi uğurunda şəhadətə hazır olmasıdır. Lakin İslam dinində şəhadət, bütün məsləklərdən fərqli olaraq özünə məxsus bir məfhuma malikdir. İslamın şəhidə bəslədiyi xüsusi rəğbəti Quran ayələri və hədislərdən daha yaxşı başa düşmək olur. Qurani-Kərim şəhidlər haqqında buyurur: "Allah yolunda şəhid olanlara ölü deməyin. Onlar diridirlər, lakin siz bunu dərk edə bilmirsiniz. "  Başqa bir ayədə buyurur: "Allah yolunda şəhid olanlara ölü deməyin! Çünki onlar diri və Tanrı yanında ruzidən bəhrələnirlər. Siz isə bunu dərk edə bilmirsiniz. " Gördüyünüz kimi Qurani-Kərim şəhidlərin diri olmasına israr edib və bu həqiqətin gerçəkliyini onların İlahi ruzisindən bəhrələnmələri ilə izah edir. Necə ki, şəhidin savabı haqqında da, belə buyurur: "Hər kim Allah yolunda cihad edib qalib gələ və ya şəhid ola biz ona çox böyük mükafat əta edərik."

Seyid Əzim İslamı matəmə çevirənlərə qarşı hiddətlənib bəd dua da edirdi:

"Həmişə fikriniz zikri-müsibətdir iradətlə,
Sizə, yarəb, cəzayi-xeyr şahi-Kərbəla versin". (Seyid Əzim.... Səh.167)

[55] Qurani-Kərim. Ali İmran - 14

övladına sələvat və salam olsun." [56]. Müəllifin klassik ədəbiyyatın minacat, nət, tövhidlər ənənəsini öz bədii nəsrində qoruyub saxlaması onun öz dini inancı ilə birbaşa bağlı idi. Hekayənin bu cəhətini " yeni dövrün ciddi və maraqlı bir məsələsinə toxunan və əsrin ictimai tələblərinə cavab verməyə çalışan Bakıxanovun minacat və nətə yer verməsi onun hələ Şərq klassik ədəbiyyatının köhnə ənənələrindən bütünlükdə yaxa qurtara bilməməsi" kimi qiymətləndirən Hidayət Əfəndiyevlə razılaşmırıq. Çünki Bakıxanovun dini görüşləri ondan tələb edirdi ki, başladığı işin rizasını ilk növbədə Allah təaladan diləsin.

Abbasqulu ağa Bakıxanovun "Kitabi-Əsgəriyyə" hekayəsinin nəzəri çəkən əsas xüsusiyyətlərindən biri də onun "Leyli və Məcnun" əsəri ilə ortaq cəhətlərə malik olmasıdır. Hekayənin müqəddiməsinin ikinci hissəsi ilk sətirdən Füzuli təbiri ilə başlayır:

"Leyli və Məcnun" da -
Saqi, mədəd et ki, dərdməndəm,
Qəm silsiləsinə paybəndəm.
"Kitabi-Əsgəriyyə"də -

"Ə...mma bə`d pabəsteyi-səlasili-möhnət (qəm silsiləsinə bağlı – K.Nəhmətova) və giriftari-zindani məhəbbət".

Füzulidən A.Bakıxanova qədər davam edən bu qəlibləri folklor ədəbiyyatından qaynaqlanan ənənəvi formullar kimi qəbul edə bilərik: "Epik əsərin əsas hissəsinin canını ənənəvi formullar təşkil edir. Bu əsərlər nəsildən nəsilə məhz formullar vasitəsilə daşınır. Nə zaman ki, ənənə yaşayır, "formul" da yaşayır. İstənilən ədəbi əsərdə hadisələrə girişi, müəyyən epizodlarda əvəzetməni, fasiləliyi, qəhrəmanların

[56] "Kitabi-Əsgəriyyə" hekayəsindən gətirilən misallar "Ədəbiyyat məcmuəsinin" 1947-ci ildə I nömrəsində dərc olunan transfoneliterasiyasından götürülmüşdür.

görünüşünü, sonu və sairəni təsvir etmək üçün müəyyən qəliblənmiş ifadələrdən istifadə olunur. Şifahi xalq ədəbiyyatında bunlar ənənvi formullar və ya ortaq ümumi yerlər (məqamlar) termini ilə ifadə olunur. Məharətli ozan və ya söyləyicilər sələflərindən qalmış, azacıq dəyişilmiş və ya yeni məcazlarla, "ümumi yerlərlə" (formullarla) öz əhvalatlarını söyləyirlər. Şifahi xalq ədəbiyyatının, əsasən, dastan və nağıl janrlarında ənənəvi formullardan çox yararlanırlar"[57]. Türk ədəbiyyatşünaslığında Əhməd Qabaqlı bu məsələyə belə aydınlıq gətirərək yazırdı: "Xalq şeirlərində məcazlar yönündə Divan şairləri ilə bir çox ortaq motivlər görünməkdədir. Xalq ədəbiyyatımızda bunlar, əlbətdə, "məzmun" icabı deyildir. Sadəcə, qulaqdan eşidilmiş, nəsildən nəslə keçərək şairin irfanına qarışmış təşbehlər, istiarələrdir. Divan məzmunlarında ən qaydalı, ən orijinal biçimlərini gördüyümüz "ay kimi üz, çox kiçik dodaq, sərv kimi uzun boy, topuğa qədər uzun saç, gül kimi yanaq" və s., zatən, o zamankı Türk-İslam toplumlarında müştərək gözəllik (estetik) ölçüləridir."[58]

Bakıxanovun "Kitabi-Əsgəriyyə" yə yazdığı müqəddimənin ikinci hissəsi məzmunu etibarilə oxucularına ünvanlanmışdır və demək olar ki, əsərin yazılma səbəblərinin izahını ifadə edir:

"Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,
Bülbüli-gülzari-möhnət Qüdsiyi-şuridəhal

bu rəsmi-dilaviz ilə firqeyi-ülul-əlbabə bəyani-mafilbal etmiş ( Dərd həbsxanasına bağlanmış, qəm-qüssədən üzülmüş, möhnət bağının bülbülü hali-pərişan Qüdsi bu incə üslubla ağıl sahibləri dəstəsinə gizli məqsədlərini bəyan etmiş.)

---

[57] İsgəndərova Vəfa Zahid qızı. Şərq folklorunda ənənvi formullar (Azərbaycan və Türkiyə dastan və nağıl mətnləri əsasında). /Filologiya məsələləri/, N-7, Bakı "Elm və təhsi", 2012, səh. 457.
[58] Ahmet Kabaklı. Türk Edebiyatı. II cilt, İstanbul, 1994, səh.786.

Müəllifin bəyanında səslənən “ülul-əlbab” kəlməsi Qurani-Kərimin ayələrinə işarədir. “Ülul-əlbab” kəlməsi Qurani-Kərimdə 21 yerdə işlənmişdir (“Bəqərə” surəsi, ayə 179, 197, 269; “Talaq”, 10; “Sad”, 29, 43; “Yusif”, 111; “Rəd”,19; “İbrahim”, 52; “Zümər”, 9, 18, 21; “Ali İmran”, 7, 190; “Maidə”, 100; və s.) [59] . Bu nişanələr ilə yazıçı insanın həyatının məqsəd və məramının elm qazanmaqdan və ömrünü cəhalətdə xarab etməkdən hər an qurtulmaq cəhdlərindən ibarət olduğunu söyləmək istəyir. “Qurani-Kərim”in bir sıra açıq ayələrinə işarə edir:

“Bəqərə” surəsi, 269-cu ayə: “Ağıl sahiblərindən başqası öyüd qəbul etməz”;

“Sad” surəsi, 29-cu ayə: “Sənə göndərdiyimiz mübarək bir kitabdır ki, ayələri üzərində düşünənlər və ağıl sahibləri ondan öyüd alsınlar”;

“Zümər” surəsi, 9-cu ayə: “De: Bilənlərlə bilməyənlər bərabərdirmi? Bundan ancaq ağıl sahibləri öyüd alırlar”;

“Maidə” surəsi, 100-cü ayə: “De ki: Kirli və pak, kirlinin çoxluğu səni təəccübləndirsə də, bir deyildir. Ey ağıl sahibləri, artıq Allahdan qorxun, bəlkə qurtulasınız”. Bakıxanov əsərinin gizli mətləblərinin yalnız ağıl sahibləri tərəfindən anlaşılacağına ümid bəsləyərək əbədiyyətə ötürüləcək qiymətli mesajlar vermişdir.

A.Bakıxanov “məşhunil-ərvahi-cünudi məcənnədə” (“ruhlarla doldurulmuş ordu timsalında”) ifadəsi ilə “Quran”ın “Əhzab” surəsinin 72-ci ayəsinə və Məhəmməd peyğəmbərin bir sözünə işarə etmişdir: “Ruhlar səfərbər edilmiş ordulardır, həmin orduların təsdiq edənləri bir-birilə birləşmiş, inkar edənləri isə bir-birilə ziddiyyətə girmişdir”[60]. Bu fikrin izahını isə Məhəmməd Füzuli “Mətləül-etiqad” əsərində belə vermişdir: “Başqa bölgü üzrə dünya əhli dörd qismə bölünür,

[59] Mahmud Ruhani. “əl-Möcəm-ül-ihsai li-əlfazil-Quran-il-kərim”, 3 cilddə
[60] Füzuli. V cild, Bakı, “Azərbaycan”,1996, səh.99

çünki bunlara görə, Tanrı cisimlərdən əvvəl ruhları yaratmış və onlara demişdir ki, "Mən sizin Tanrınınz deyiləmmi?". O ruhların bəzisi "bəli", bəzisi isə "xeyr" demişdir. Sonra Tanrı həmin sözü yenidən təkrar etmişdir. Bu dəfə təsdiq edənlərin bəzisi inkar etmiş, inkar edənlərin bəzisi isə təsdiq etmişdir. Bundan sonra həmin ruhlar dağılışaraq tədriclə cisimlər aləminə yönəlmişlər. Onların içərisində həm ilk, həm də son dəfə "yox" deyənlər kafir olmuş və iman gətirməmişlər. İlk dəfə təsdiq edib sonra inkar edənlər əvvəlcə mömin olmuş, sonra isə kafirə çevrilmişlər. Bunların əksinə olanlar isə əksinə olmuşdurlar. Belə bir gün "Yövmül-misaq" (Əhdi-peyman günü) adlanmışdır. Cəsədlər arasındakı birləşmə və ayrılma həmin günün saziş və ayrılması nəticəsidir."[61]

Əsərin girişində bəhsi açılan "Ma təkərrümiha" ("O şey ki, onu kərəm sahibi edir") sübutlar ixtilafına aydınlıq gətirmək üçün müəllifin "Təhzibül-əxlaq" əsərinə nəzər salmağımız yetərlidir. A.Bakıxanov insaf haqqında danışarkən ədalət anlayışına dəqiq münasibətini bildirərək yazır: "İnsafın lüğəvi mənası ədalət deməkdir, çünki burada bölgü eyni dərəcədə hər iki tərəfə aid olur. Ədalət və insafın ikisinin də tələbi birdir. Yalnız ümumilik və xüsusilikdə təfavütü vardır, çünki ədalət fitri olmaya da bilər. İnsan ədalət və məsləhəti gözləmək məqsədi ilə zülmdən saqınar. Beləliklə, hər bir insaflı adam ədalətli olar; amma hər bir ədalətli adama insaflı demək olmaz. İnsaf fitri olsa da, əqli təhqiqatsız davamlı olmaz. Həvayi-nəfs, şübhə və tərəddüd onu puç edər. Çox vaxt insan adət dolayısı ilə pis işi bəyənər, zülmü yaxşılıq zənn edər"[62]. Yazıçı hekayədə də məhz bu mətləbə toxunmaq istədiyini əsərin girişində simvolik şəkildə ifadə etmişdir. Əsərin mövzusunun bir istiqaməti mərhəmət və ədalət məsələləridir.

[61] Füzuli. V cild, Bakı, "Azərbaycan",1996, səh.99
[62] Abbasqulu ağa Bakıxanov. Seçilmiş əsərləri. Bakı, 1984, səh.55

Yazıçı daha sonra qeyd edir ki, əsərin hikmət məzmunundan biri də budur ki, "Həmələhal –insanu innəhu kanə zəlumən cəhula" (Qurani-Kərimdən "Əhzab" surəsinin 72-ci ayəsinin bir cümləsidir. Ayə belədir: "Biz əmanəti (Allaha itaət və ibadəti) göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən o, çox zalım, çox cahildir".) ifadəsinə görə insanlar bəşər vücudu bağında sıxıntı pöhrələrini əkmişlər".

Bakıxanov əsərin məzmunu ilə oxucularına demək istəyir ki, "Surət aləmində bəşər təbiətindən lazım olan tələb budur ki, hər kimsə gərək bir növ məqsəd ilə könül gözünü pardaxlasın, şərəfli ömrünü puç və faydasız keçirməsin, hadisələr məclisində öyrənmək tələbi olan ağıl sahiblərinə qəflət camından cəhl badəsini içirməsin" . Yazıçı kamalın əlaməti kimi "könüldə eşq nişanəsini, qəm bəzəyini, eşq əfsanəsini" görür. Könlündə eşqi olmayanları "saflıq, xalislik ləzzətini ələ gətirməkdən" məhrum olunmuşlar hesab edir. Bakıxanova görə, eşq insanın təbiətinin islahı üçün vasitədir. Eşq haqqında fəlsəfi fikirlərini doqquz beytlik şeir parçasında ifadə edərkən fikrini daha da qüvvətləndirərək deyir:

"Eşq ilə cahanda biniyaz ol,
Amma rəvişinlə pakbaz ol!"

Bununla da demək istəyir ki, eşq insanı dünya mənfəətlərinə ehtiyacsız edir, beləliklə o, davranışında yalnız təmizliyi sevəcəkdir. Fikirlərinə Əsgəri misal gətirərək göstərir ki, "dilbərinə qovuşma həvəsinin meyli" ilə cəfanın iradəsinə qarşı vəfada sindan kimi sərtdir". Lakin "ağız yolu ah ilə bağlanar, müsibətlə dolu olanlar kora bənzəyərlər". Göründüyü kimi, burada müəllifin qələmə aldığı hadisəyə tənqidi münasibəti də özünü büruzə verir: yəni, lirik tərənnümlə başlayan münasibət inkarla yekunlaşır. Burada Əsgərin öz məhəbbətində dayanıqlı olmasına baxmayaraq, göz yaşıyla boğularaq problemin həllində çarəsizliyi öz ifadəsini

tapmışdır. Eyni münasibəti hekayənin daha bir cümləsində görürük: "Əlqissə, ol iki atəşparə bir-birə yetmək ilə atəşi-məhəbbət nairəəfruz olub xərməni-dilü dini yandırdı". Burada da söhbət gənclərin öz davranışları ilə imanın və qəlb rahatlığının bünövrəsini sarsıtmalarından gedir. "Təhzibi-əxlaq" əsərində də yazıçı "qənaətin şərtləri haqqında" danışarkən eyni ifadəni işlətmişdir: "Qənaətcil adamın əldə edəcəyi saysız-hesabsız faydalardan ən başlıcası dörddür. ... Dördüncüsü, dinin və ürəyin xırmanına od vuran paxıllıqdan salamat qalar. Doğrudan da, paxıllıq odundan yandırıcı od hələ ki görünməmişdir". Göründüyü kimi, Əsgərin göz yaşına boğulmasını müəllif "dinin və ürəyin xırmanına od vuran" mənfi xüsusiyyətlərə aid edir. Bu göstərilənlər də yazıçının öz qəhrəmanının davranışlarına mənfi münasibətinin ifadəsi kimi diqqətimizi çəkir.

Hekayənin məzmunu Əsgərin oxuculara təqdimi ilə başlayır: "Adı çəkilmiş canı yanan sadiq aşiq və təngə gətirilmiş olan halı pərişan biçarə aşiqin əhvalının qısaca xülasəsi möhnəti-məlalda rəftarının izahı oldur ki, Quba şəhərində Ahəngərzadə Əsgər adlı bit təzə yetişmiş şirin cavan cazibədar xasiyyətli olub ki, hüsnü söhbət bəyanında və gözəllikdə zahiri cəhətdən camalda bənzəri yox idi". Əsgərin tərifini tamamlamaq üçün əlavə etdiyi nəzm parçasında da onun daxili məziyyətlərini deyil, zahiri cazibəsini tərənnüm edir və etirafnamə olaraq bunu deməyi də özünə borc bilir ki, "Göftarı fününi-mehrə inkar"dır ("Söhbəti məhəbbət fənninə inkardır"). Bununla da müəllif Əsgərin məşğul olduğu mərsiyəxanlıq peşəsinə öz münasibətini göstərmiş olur. Bakıxanovun hekayənin əvvəlində vurğuladığı kimi, mövzunu "incə mətləb ilə ağıl sahiblərinə" bəyan etdiyindən və "bu ləzzətli üslubla nişanələr qələmini yürütdü"yündən həqiqətə varmaq üçün əsərin hər cümləsi oxucudan dərin mühakimələr tələb edir. "Nişanələr qələmilə" ifadəsi yazıçının əsərini eyhamların dili ilə yazmasının etirafıdır. Bakıxanovun tənqidi

münasibəti əsərin girişindən etibarən özünü göstərməyə başlayır. Hər iki şeir parçasında lirizmi inkar yekunlaşdırır.

Əsərin diqqət çəkən xüsusiyyətlərindən biri də Füzuli lirikasının dərin təsiridir. Hekayənin girişi “Şikayətnamə”nin başlanğıcı ilə forma və üslub baxımından səsləşir. Əsgərin gözəlliyini tərənnüm edən nəzm parçasında da Füzulinin nəfəsi aydın duyulur:

“Leyli və Məcnun”da:
“Leyli səri-zülfünü girehgir qılan
Məcnuni-həzin boynuna zəncir qılan!”

“Kitabi-Əsgəriyyə”də:
“Bir kəc küləhi ki, zülfü kakil,
Boynuna salıb misali-zünnar.”

Füzuli Leylinin buruq saçlarını hüznlü Məcnunun boynuna eşq zənciri kimi mənalandırır. Bakıxanov isə Əsgərin buruq saçlarını öz boynuna salınmış zünnara (xristianların riyazət əlaməti olaraq altdan bədənlərinə sarıdıqları sərt qurşağa) bənzədir. Bunların ardınca hekayədə Əsgərin “minbərlər rəisləri, böyüklər yığılan yerdə daha kiçik mərsiyəxan” olaraq “bəlkə kəndisinin işlərinin aqibətini yad edib nalə və fəryadla həmyoldaş” olması qeyd olunur. Bu məqamda yenə Füzuli yada düşür:

“Leyli və Məcnun”da:
“Axır günün əvvəl eyləyib yad,
Axıtdı sirişkü qıldı fəryad”.

Lakin bu eynilik sözün müstəqim mənasında “təqlid” deyil, daha çox “yamsılama” kimi görünür ki, əsərin elə ilk sətirlərindən də xəfif gülüş lirik intonasiyanı müşaiyət etməyə başlayır. Burada Əsgərin adı ilə bağlı bir dilemma da yaradılmışdır. Əsgərin mövqeyini “məcməi-əkabirdəvü əsağirdə mərsiyəxan” (böyüklər məclisində ən kiçik mərsiyəxan) kimi müəyyənləşdirən yazıçı əsərini “Ən kiçiklərin kitabı” adlandırmaqmı istəmişdir?!

Hidayət Əfəndiyev isə "Kitabi-Əsgəriyyə" hekayəsi ilə Bakıxanovun özünün "Riyazül-Qüds" əsəri və Füzulinin "Hədiqətüs-süəda" əsəri arasında bənzərliklərdən söhbət açırdı: "Kitabi-Əsgəriyyə" öz quruluşu etibarilə bir tərəfdən müəllifin ilk nəsr əsəri olan "Riyazül-Qüds"ə , o biri tərəfdən isə Füzulinin "Hədiqətüs-süəda"sına çox yaxındır....Demək olar ki, "Kitabi-Əsgəriyyə"də verilmiş bütün şeir parçalarında biz Füzuli yaradıcılığının dərin təsirini görürük. Bu, Bakıxanovun hekayəsindən alınmış aşağıdakı parçalar üzərində özünü daha aydın hiss etdirir:

Söylə, ey həmdəm, kərəm qıl hali-yarımdan mənə,
Həqq rizası, bir xəbər ver gülüzarımdan mənə.

Görün bu misralar Füzulinin "Hədiqətüs-süəda"sından aldığımız aşağıdakı beytlə nə qədər yaxından səsləşir:

Bir xəbər ver, ey səba, ol mahi-tabandan mənə,
Kim, qəmi-eşqində yüz qəm yetdi dövrandan mənə"[63].

Ümumiyyətlə, "Kitabi-Əsgəriyyə" hekayəsinin Füzuli leksikonunda yazıldığını çox aydın müşahidə edə bilirik. Yalnız A.Bakıxanova deyil, bütövlükdə, XIX əsr bədii ədəbiyyatına Füzuli təsirini, onun satirik üslubunun və realist təmayüllərinin nəticəsi kimi görürük. Bunu Seyid Əzim Şirvaninin yaradıcılığında da aydın müşahidə etmək mümkündür. S.Ə.Şirvani Füzulinin "Bəngü badə" əsərinə nəzirə olaraq "Siçan və pişik" dastanını yazmışdır. Bu əsərin yazılması səbəbini isə belə izah edirdi:

Etmə mənə eyb bu əhvalı sən,
Əhlimizin danişinə halisən.
Yüz çəkəsən riştəyə dürrü gühər,
Yoxdu xəridar ona bir nəfər.
Gövhərə var idi xəridar əgər,
İçdi Füzuli niyə xuni-cigər.
Bəng nədi, badəni nəzm eylədi,

[63] H.Əfəndiyev. Azərbaycan bədii nəsri tarixi. Bakı, 1964, səh.103

Buzeyi-dilsadəni nəzm eylədi.
Şairi-Bağdad, o şirinxitab
Zahid ilə Rində yazıb bir kitab[64].

S.Ə.Şirvani də öz məsnəvisində Füzuli kimi ictimai problemləri işıqlandırmaq üçün alleqoriyadan istifadə etdiyini vurğulamışdır. Füzulinin "Leyli və Məcnun"u, "Bəngü badə"si, A.Bakıxanovun "Kitabi-Əsgəriyyə"si, S.Ə.Şirvaninin "Siçan və pişik" əsəri – bunların hər biri həyatı obrazlarla qavrayan ədəbi şəxsiyyətlərin həqiqəti dərkinin və ifadəsinin bir formasıdır. Leyli və Məcnunun öz məhəbbətləri uğrunda keçdikləri yol həqiqi eşqə aparan yoldur, Əsgərin məhəbbəti uğrunda mübarizəsinin meydanı ictimai mühitdir, siçan və pişik obrazları timsalında şair ictimai mühitin kolliziyalarını işıqlandırırdı. Hər üç ədibi birləşdirən ortaq bir xüsusiyyət məcaz yoluna bağlı olmalarıdır. Füzuli "tələbi-həqiqətə rahi-məcaz" tuturdusa, Bakıxanov "əlvahi-zəmairi-ərbabül-bəsairə bu şiveyi-zövqəngiz ilə qələmi-əlam yürütmüş"dürsə, Seyid Əzim "xarü xəsək"dən ("çör-çöp") də "ətrü gülab" çəkməyə üstünlük verirdi. Hər üç ədib bir süjet əsasında müxtəlif məzmunlar əhatə edirdilər, burada həqiqi və məcazi mənalar biri digərindən ayrı deyildir. Füzulinin "Leyli və Məcnun"u ilahi eşqi tərənnüm edirdisə də, orta əsrlərdə feodal cəmiyyətdə məcazi eşqin bəlalarını da əks etdirirdi. Bakıxanov öz dövründə məcazi eşqin bəlalarını əks etdirirdisə də, ictimai mühitin dini təfəkkürünü və ənənəvi yaşayışını göstərməyə çalışırdı. Seyid Əzim uşaqlar üçün siçan və pişiyin mübarizəsini göstərməklə mütaliəyə cəlb edirdisə də, böyüklərə onların yaşadıqları cəmiyyətdəki eybəcərlikləri ifşa edirdi. Adı çəkilən bu əsərlərin qeyd olunan məziyyətlərini Seyid Əzimin öz əsərində istifadə etdiyi ifadə ilə daha dəqiq

[64] Seyid Əzim Şirvani. Seçilmiş əsərləri. Bakı, 1990, səh.169.

qiymətləndirə bilərik: "Qəllə və dəllə hüvə xeyrül-kəlam" ("Sözün yaxşısı az sözlə çox məna ifadə edənidir")[65].

"Kitabi-Əsgəriyyə" hekayəsinin baş qəhrəmanı Əsgər Quba şəhərinin Ərdəbillilər məhəlləsinin məscidində dövrün yeganəsi hesab edilən "mərsiyəxanların başçısı" olan ustadından təlim alırdı və bu yolla onun "əzəmətli hərəmsarayına məhrəmiyyət yolu ilə gedərdi". Burada da hadisənin təsvirində müəllifin istehzası duyulur. Bu istehza ustad olan mərsiyəxana, onun həyat tərzinə və təliminə yönəldilmişdir. Əsərin mühim tənqid obyektlərindən birincisi elə məhz mərsiyəxanlıqdır. Mərsiyəxanlığın XIX əsrin mütəfəkkirləri düşündürən bir məsələ olduğunu Mirzə Fətəli Axundovun münasibətində daha aydın görə bilirik:

"Təziyədarlığın İran şahlarının əli ilə süni surətdə Azərbaycan xalqına bağlanıldığını, ruhanilərin əlində gəlir mənbəyinə çevridiyini, bu sahədə yazılan əsərlərin uydurulmuş yalanlardan ibarət olduğunu M.F.Axundov aydın dəlillərlə şərh etmiş və mərsiyəçiliyi şiəliyin ziyanlı təsiri kimi pisləmişdir. O, bu xüsusda yazmışdır: "Təziyədarlıq bir əmri-məhdəsdir ki, padşahani-isna əşəriyyə ("On iki imamlı padşahlar" deməkdir. Səfəvi şahları nəzərdə tutulur.) öz politikalarının səlahı üçün ona əhdəs etdilər. Əvvəl Dəlayimə [66] hicrətdən 300 ildən keçmiş, sonra Səfəviyyə üləma dəxi, əvvələn səlatini-isnai-əşəriyyənin xatiri üçün bu

---

[65] Seyid Əzim Şirvani. Seçilmiş əsərləri. Bakı, 1990, səh. 167.

[66] "Məhərrəm ayının ilk on günündə Seyidüş-şühədaya matəm saxlamaq, qara geymək, küçə-bazarda qara parçalar çəkmək, dükanları bağlamaq, aşura günü xörək bişirməyi qadağan etmək mərasimi ilk dəfə Bağdadda Müizüddövlə Deyləmi tərəfindən icra edilmişdir. Bu mərasim Toğrul Səlcuqinin Bağdadda taxta oturmasına və Deyləmilər dövlətinin süqutunadək bütün müsəlman ölkələrində keçirilirdi. Kərbəla çölünün şəbihini göstərmək mərasimi də I Şah Təhmasib dövründən, hicri qəməri 960 (1552) –ci ildən başlanmışdır" (Məhəmmədəli Tərbiyət, Danişməndani-Azərbaycan. Bakı, 1981, səh. 354-355).

əmri-məhdəsi təcviz etdilər. Saniyən xəlq rəftə-rəftə adətkərdə oldu və üləma dəxi bu əmri-məhdəsin zimnində özləri üçün mənafei-kəsirə mülahizə etdilər və onun tərvicinə çalışdılar və bu xüsusda ənva və əqsam kizbdən məmlu təsnifat müntəşir etdilər, "Məsaibül-əbrar" kimi və sairləri kimi ki, hər aqil və həkim şəxs oxuyanda əti tökülür ondan ötrü ki, əkbari-kaziləsinin həddi və həsri yoxdur". Ümumiyyətlə, XIX əsrin ən təsirli trubunası olan ruhaniliyin məhz fırıldaqçılar, savadsız din xadimlərinin əlində qəsbkarlıq vasitəsinə çevrilməsi problemi ilk bədii nəsr nümunələrimizin hər birində toxunulan ən mühim məsələlərdən biridir. M.F.Axundovun "Aldanmış kəvakib" əsərində mollabaşı və münəccimbaşı obrazları elə məhz "Kitabi-Əsgəriyyə"dəki "mərsiyəxanlar sərxeylinin" məsləkdaşlarıdır. C.Məmmədquluzadə "Danabaş kəndinin əhvalatları" povestinin də ilk səhifəsindən məhz mollanın mərsiyəxanlığının tənqidi ilə təhkiyəsini sürdürürdü: "Bildir bizim kənddə o taydan bir molla mərsiyə oxuyurdu..." Sultanməcid Qənizadənin "Məktubati-Şeyda bəy Şirvani" əsərində isə özünü "mömin" adlandırıb təfriqə ilə məşğul olan "Sufi əmi"lər, "Ağa Kərbəlayilər" ifşa olunur.

"Kitabi-Əsgəriyyə" hekayəsinin əsas qəhrəmanı Əsgər ustadının gözəllikdə misli olmayan qızı ilə ünsiyyət bağlayıb gün-gündən məhəbbətini artırır: "...arzunun əlaməti bir məqama yetdi ki, zövqi-aləmdə guya iki cismdə bir ruh oldu."

"Leyli və Məcnun"da:

"Övzai-müxalif oldu yeksan;
Guya iki təndə idi bir can."

Bu ərəfədə müəllim olan mərsiyəxan qəflətən dünyasını dəyişir. Hekayənin "zavyazkası" da buradan başlayır. Hadisələrin təsviri tamamilə lirik intonasiyadan çıxıb satirik-yumoristik çalar alır: "Bu əsnada məlum olan müəllim hadisələr aləmindən əlaqələr bağını qırıb bəzəkli hurilərlə qucaqlaşdı və şərab piyaləsinin nəşəsi ilə paklaşdı (rəhmətullahi-əleyh)".

Mərsiyəxan son nəfəsində vəsiyyətini oz tələbəsinə edir: "... əhli-beyti-naşünasın (tanınmayan ev adamlarını), xüsusən Hüseyn və Abbasın və miras qalan müxəlləfatdan (mal-mülkündən ) əmmamə, pustin (kürk) və əbasın, cübbə, şanə (daraq), misvak və ridasın (dərvişlərin çiyinlərinə atdıqları yun qumaş), küləcə (yarımxəz üst geyimi), şali-kəmərbənd (parçadan olan belbağı) və qabasın (üst paltarı) ol cavana həvalə edib yerində canişin etdi". Mərsiyəxan iki oğlunu, qızı və arvadını cüzi "müxəlləfat" ilə yeniyetmə bir gəncin himayəsinə verir. Cavan mərsiyaxanın boynuna vəlilik və vəsilik kimi ağır vəzifə qoyulur. Lakin cavan aşiq bu yükün ağırlığından xəbərdar deyil, o, hələ özgə xəyaldadır: "O, dəxi nişatü nəhayət sevincdən ürəyi açılaraq görüş məkanına məhrəm olub zövqlə ruzigarın keçirirdi". O zamana qədər ki, cahil mühit, bekar və sözgəzdirən adamlar bu ünsiyyətdən xəbər tutur. Bu məqam əsərin yüksələn xətlə inkişaf edən konfliktinin birinci mərhələsini təşkil edir. Konflikt burada, əslində, fərdlər arasında deyil, ənənə və şəriət arasındadır: formal əxlaq tərəfdarları və İslamın verdiyi azad nikah haqları qarşı-qarşıya gəlir. Lakin elmsiz bir cəmiyyətin sütunları yalnız ənənədir: "Avam adamların idrak və mərifətlərinin yüksək dərəcəsi təqliddir. Onlar heç bir halda təqliddən kənara çıxmağa qadir deyillər. Etdikləri hər cür təhqiqat və təfəkkür zirəklikdən deyil, adət üzündəndir"[67].

Yazıçı sevgililərin qovuşmasındakı maneələri "dəsti-müsibət" adlandırır. Bu maneələrdən birincisi "bivəfa ərdəbillilər"dir ki, mərsiyəxanın qızının dilindən onların mühiti tənqid olunur:

Yoxdur bizə bir rəhm qılan sahibi-namus,
Səd ah, səd əfsus!
Bu şəhridə bir mö`münü dindar tapılmaz,
Gər var, tapılmaz.

---

[67] Abbasqulu ağa Bakıxanov, Seçilmiş əsərləri, Bakı, 1984, səh. 31-32

Bu müsibət dəstinə qızın qardaşları olan Hüseyn və Abbas da daxildir: "Ah bunları bu hal ilə görüb və dəsti-müsibət başa vurub kim gəldi?

Beyt

Hüseyn! Hansı Hüseyn? Dudmanın şərəfi,
Desəm dürüstünü əhli-zəmanə naxələfi.

Qız öz qardaşına qarğış edərək " Ah qardaş, kaş sənin kimi naxələf ölə idi, bu günləri görməyə idi", onu "əxül-idbar" da adlandırır.

Daha sonra yazıçı xarakterin açılmasına kömək edən dialoqa müraciət edir:

- "Ey arami-canım! Fikr elə ki, atandan qalan əmmaməni başıma qoyub, əbasın çiynimə salıb və Abbasın qucağıma alıb bir nifrin eləyərəm ki, düşmənlərimizdən biri də yer üzündə qalmaz.

- Ey aşiqi-mehribanım! Bu sözlər fayda verməz. Bir fikir elə ki, bu yerə gəlmək üçün əlində bəhanə olsun və xalq bədgüman etməsin".

Əsgərin xarakterinin açılması üçün burada yazıçı oxucunu bir qədər intizarda saxlayır. Əsgərin nitqindəki ironiyanın onun özünə, yoxsa müəllifə aid olduğunu hələ qəti müəyyənləşdirmək olmur. Hekayədə obrazların xarakteri onların öz nitqində açıldığı üçün hər bir növbəti dialoq məhz bu məqsədə xidmət edir.

Əsgərin maneələri aşmağa qüdrəti yoxdur. Buna görə də o, sevgilisi ilə bəhanəsiz görüşə bilməyəcəyi üçün hiyləyə əl atmalı olur: "- Ey yari mehribanım! On şahi pul sənə verim, amma məni rədd etmə, hər vaxt gəlib ol məbləği geri tələb eyləsəm, hər bəhanə ilə təxir et. Bəlkə bu vəsilə ilə bir-birimizi görmək müyəssər ola." Məcnun da Leyli ilə görüşmək üçün hiylə işlədir:

"Məktəbdən olan zamanlar azad
Vəsl üçün edərdi hiylə bünyad:
Qəsd ilə nihan edib kitabın,

Həddən aşırardı iztirabın.
Leyli yolunu tutub durardı,
“Sən gördün ola? – deyib sorardı.
Yəni bu bəhanə ilə bir dəm,
Yarın görə, ola şadü xürrəm.”

Lakin bu bəhanə də “alçaqları bəsləyən aləm” içində fayda vermir. Bu məsələni maraqlı bir hadisə kimi məhəllə rəisinə çatdırırlar. O da öz növbəsində əmr verir ki, aşiqi harada görsələr, tutub işgəncə versinlər. Əsgərin bu mübarizədə silahı qanun və dəlil deyil, and və qarğış olur. Axır bir gün “çörəyin üstünə kərə yaxıb yola çıxır” və məhəllə rəisinə öz and və qarğışını yetirir. Və bununla da yuxarıdakı bəhsimizə aydınlıq gətirilmiş olur ki, Əsgərin mövhum inancları müəllifin istehza obyektidir. Məhəllə rəisi üçün də məsələni qanunlar deyil, qorxu və xof həll etmiş olur. Üstəlik, əgər “çörəyin üstünə kərəni” rəisə bağışlanmış hədiyyə kimi başa düşsək, mövzuya bir də rüşvət məsələsini əlavə etmiş olarıq. Amma qeybət daha amansızdır. Məhəllə adamları arasında söz-söhbət kəsilmədiyindən Əsgərin sevgilisi Quba şəhərini müəyyən müddətə tərk etməli olur. Bu ayrılıq məqamında sevgililərin göz yaşı, ahı və naləsi mübaliğəli və xəfif bir yumoristik dillə hekayənin yeni mövzusuna çevrilir: “Xülasə, növbənöv nalə və şivən ilə bir-birindən vida edib, məşuqə səfər qıldı”; “Ol qəmli məzlumə dəxi, gündüzlər qərarsız axan göz yaşlarını yollara sübut edərdi, gecələr yataq otağının şə`mini ah alovu ilə yandırardı. Göz yaşı və nalə ilə qapanaraq gəzirdi, ürək qəmli, göz nəmli, hər mənzilə kim vürud edər, bu növ`ilə nəğmə deməyə başlayardı”. Nəhayət, vüsal dəmi yetişir, lakin ardınca daha böyük bir fəlakət gətirmiş olur. Konfliktin ikinci düyünü: Əsgərin sevgilisi bildirir ki, “...atan vəsfini bəyan etdiyindən mehriban anam dəxi ona aşiq olmuşdur”. Bu yeni situasiya Əsgərin göz yaşını artırsa da, oxucunun daha şiddətli gülüşünə səbəb olur. Əsərdə tədbirli bir obraz kimi çıxış edən sevgili qız qanun və şəriəti

yada salır: "Nə ola əgər varub şəriət ehkamında diqqətlə araşdırasan, əgər caiz və mübah (şəriətcə haram və məkruh olmayan şey) olsa, məni sən aldıqdan sonra hörmətli validəmi də ki, böyük mövqe tutmuş validinin təzvici (nikahı) ilə şad qılasan". Gülüş getdikcə şiddətlənir və yenə öz hədəfini "ustad" mərsiyəxanın üzərinə yönəldir: "... əhli-beyt arasında təfriqə düşməsin. Və Abbas, Hüseyn bir-birindən ayrılmasın və başsız qalmış mirasın cəminə (Miras da ki məlumdur – K.Nəhmətova) malik olub alimiqdar validim məqamında onu əvəz edən ada sahib olasan". Bu cümlədə yenə mərsiyəxanın zahiri atributlarla bəzədiyi həyatı yazıçının satirik gülüşünə hədəf olur.

Əsgər məsələni şəriət baxımından aydınıaşdırmaq üçün dövrünün "yeganəsi" hesab olunan "fəzilət sahibi bir alimə" müraciət edir. Əsgərin sualı əsərin konfliktinin əsas düyün nöqtəsidir: " Bir kimsə əgər həddi-büluğa çatmamış bir qızı nikah yaşına qədər böyütsə, qəflətən nikahlı atasının qızın anasından izdivac mənfəəti alması caizdirmi?" Lakin alim bu məsələni şəriət qanunlarına əsasən həll etmək əvəzinə, "məzhəbi-eşq", "fitvayi-piri-eşq" (eşq təriqətinin başçısının hökmü) kimi mücərrəd və əsassız anlayışlarla məsələni həllolunmazlığa qədər gətirib çıxarır. " Hələ ki mətləb düyünlərinin çözümü yubanırdı" və bununla da konfliktin üçüncü mərhələsi razvyazkasız finala qədəm qoyur. Lakin şəriətdə bu məsələdə heç bir maneə yoxdur. Problemin təzahür etdiyi "ərdəbillilər" məhəlləsinin inandığı şiə məzhəbinə görə də məsələ "caiz" deyə həll olunmalıdır. Cəfəri məzhəbli müsəlmanların böyük əksəriyyətinin təqlid etdiyi Ayətullahül-üzma Seyyid Əli Sistaninin "Tövzihül-məsail" ( bu cür kitablara da qısaca olaraq "risalə" deyilir) kitabında "Məsələ 2411" maddəsi ilə göstərilir: " Əgər bir qadının keçmiş ərindən bir qızı olsa, sonrakı ər o qızı bu qadından olmayan oğlu üçün əqd edə ( kəbin kəsdirə) bilər. Həmçinin bir qızı öz oğlu üçün əqd etsə, o qızın anası ilə izdivac edə bilər". Bu

məsələni bütün şiə müctəhidləri qəbul edirlər. Həm keçmişdə yaşamış, həm də müasir müctəhidlərin risaləsində bu məsələ vardır. Sünnü məzhəblərində də məsələ eynilə bu cür həll olunur:

“ – Anasını baba, kızını da oğlu ala bilirmi?

Bir yanda ana ilə kızı, bir yanda baba ilə oğlu. Daha öncə aralarında sıhriyyet (evlənməklə yaranan qohumluq) bulunmadığı için baba olan adam kadınla, oğlu da o kadının kızıyla evlənəbiləcəyi qibi, bunun aksi de caizdir. Yani baba kız ilə, oğlu da o kızın anasıyla evlene bilir”. (Celal Yıldırım, Kaynaklarıyla İslam Fıkhı, Uysal Kitabevi: 2/447) (Sünni mənbədən fətvalar “Dar-ül-kitab İslam Ansiklopedisi” elektron ensiklopediyasına istinadən verilib: www.darulkitab.com). Ortada ikinci bir məsələ də var ki, bu da Əsgərin sevdiyi qıza, onun anasına və qardaşlarına qəyyumluğudur. Lakin bu məsələdə də şəriətcə heç bir qadağa görünmür, çünki vəli olan gənclə onun sevdiyi qız arasında əvvəldən heç bir qohumluq əlaqəsi olmamışdır. Konflikti mürəkkəbləşdirən daha mühüm bir məsələ də yalnız böyüdücü rakursdan baxdıqda nəzərə çarpacaq bir xüsusdur ki, bu da qızın hələ həddi-büluğa çatmamasıdır. Bu məsələni yazıçı ötəri bir ifadənin içərisində gizləmişdir: “Bir kimsə əgər bir səbiyyəni həbaleyi-nikahə gətirsə,..” Bütün bunlarla yazıçı kiçik bir məhəllədə böyük kolliziyalar yaratmaqla dövrünün minipanoramını göz önünə gətirməyə çalışmışdır.

Final : Əsgər o qədər nalə və şivən qopardı ki, bihuş olub zahirə açılan gözləri qapandı və bəsirət gözü açıldı. Yuxu aləmində gördü ki, ustadı minbərə çıxıb moizələr edərkən onu çağırıb qızını Əsgərə nikahlayır: “- Ey gözümün işığı! Xoştale qızımı sənə nikahladım. Bundan sonra mənim malım və əyalım sənə məxsusdur. Amma gərəkdir ki, mənim Abbasımı əziz tutasan, nəvazişlər edəsən”. Əsgər yuxunu xeyrə yozub dostlarına danışır və “cəlal sahibinin yardım edən lütfünü arzulamaqla uzun müddət gözləyir”. Göründüyü kimi, hekayə

Əsgərin xarakterinə uygun olaraq mövhumi sonluqla bitir və konflikt həll olunmamış qalır.

Burada yenə də "Leyli və Məcnun" arasındakı bənzərliyi görürük:

"Kitabi-Əsgəriyyə"də:

"Pəs , Əsgəri-xunincigər ləbbeykquyan ehrami-ixlas bağlayıb təhsili-səfayə səy edib, kəndisin Kəbeyi-məqsudə qurban vermək üçün məqamından durub hüzurunə getdikdə dedi".

"Leyli və Məcnun"da:

"Ləbbeyk" deyib ayağa durdu,
Ol Kəbeyi-məqsudə üz urdu."

Göründüyü kimi, "Kitabi-Əsgəriyyə" hekayəsinin süjet və kompozisiyasına "Leyli və Məcnun" poemasının təsirini əsərin sonuna kimi izləyirik. Hekayənin sonunun yuxu ilə bitməsi faktorunu "Leyli və Məcnun" poemasında da görürük:

"Bu, Zeydin Leyli ilə Məcnunu röyasında gördüyüdür
Ol məşhədə Zeyd olub mücavir,
Asari-sədaqət etdi zahir.
Təmir üçün etdi çox ətalər,
Tədric ilə qıldı çox binalər.
Peyvəstə hərarəti-cigərdən,
Qəndili-məzarin etdi rövşən.
Carub ilə ab olanda mətlub,
Müjgan ilə əşki abü carub.
Hər ləhzə qılırdı tazə matəm,
Qılmazdı fəğanü naləsin kəm.
Ol munisü müşfiqü müvafiq,
Bir gecə qəribi-sübhi-sadiq,
Bimar tənində qalmayıb tab,
Qılmışdı məzarə yastanıb xab;
Xab içrə göründü ol nizarə,
Bir bağidə iki mahiparə;
Rüxsarlərində zövqdən nur,

Bimi-qəmü qüssədən dur.
Xoşvəqtü nişatməndü dilşad,
Əğyar təərrüzündən azad.
Hər məhvəşə min firiştəsurət,
İxlas ilə olmuş əhli-xidmət.
Sordu ki – “Bunlar nə mahlərdir?
Nə rütbəli padşahlərdir?
Bu rövzə nə rövzeyi-bərindir,
Bu qövm nə qövmi-nazənindir?”
-“Budur” - dedilər – riyazi-rizvan
Bu qövmi-xocəstə-hurü qılman.
Bu iki mahi - xücəstərüxsar
Məcnun ilə Leylyliyi-vəfadar.
Çün vadiyi-eşqə girdilər pak,
Ol paklik ilə oldular xak.
Mənzilləri oldu baği-rizvan,
Çakərləri oldu hurü qılman.
Çün bunda riza verib qəzayə,
Səbr eylədilər qəmü bəlayə,
Getdikcə cahani-bivəfadən,
Qurtuldular ol qəmü bəladən.
Çün Zeyd yuxudan oldu bidar,
Bu nüktəyi etdi xəlqə izhar.
Xəlqin olub e`tiqadı əfzun,
Ol qəbrə ziyarət oldu qanun.”

“Leyli və Məcnun” poemasının bu parçasında deyildiyi kimi, Zeyd Leylinin və Məcnunun qəbrinin üstündə mücavir kimi çalışır. “Məhəbbətin cəfasını”, “məlamətin bəlasını” çəkmiş bu “nədimi-nadir” Məcnunun dərdindən xəstələnib məzarın üstündə dərin yuxuya dalarkən Leylini və Məcnunu səfalı bir bağda hurilər arasında görür. Qəzaya razı olub qəm və bəlaya səbr etdikləri üçün cənnətə düşmüş olduqları Zeydə əyan olur. Ayılıb yuxusunu xalqa danışır və o gündən onların qəbri ziyarətgaha çevrilir. Göründüyü kimi, əsərdə yuxu ilə bağlı

sonluq idealist mahiyyət daşıyır və Leyli və Məcnunun qovuşması irrasional həllini tapmış olur. A.Bakıxanov isə yuxu ünsürünə irreal mövqedən yanaşmışdır. Burada da biz bir daha "Leyli və Məcnun" əsərinin lirizminin "Kitabi-Əsgəriyyə" hekayəsinə parodik tətbiqini müşahidə etmiş oluruq.

Hekayənin epiloqu isə yazıçının ümidini və duasını əks etdirir: "Ümidvaram ki, inşallah-təala ən yaxın zamanda aralarında qovuşma vaqe olub, təbrik ədası ilə mübarəkbad edim və ol məzmunə yeni inşa qılım". Epiloqda da Füzulinin "Leyli və Məcnun"u ilə paralellik görürük.

"Leyli və Məcnun"da:

"Bu, həzrəti-izzətdən həmd ilə istimdadi-mətalibdir və
Asari-şükr ilə istid`ayi-sətri-laibdir

Əlhəmdü livahibil-məkarim,
Vəş-şükrü lisahibil-mərahim".

"Kitabi-Əsgəriyyə"də:

"İlahi, bu duamı müstəcab et,
Hüsuli-mətləbi-feyz intisab et!

Əlhəmdü livahibil -ətiyyə,
Vəş-şükrü lixaliqil-bəriyə".

"Kitabi-Əsgəriyyə" əsərinin çoxcəhətli xüsusiyyətləri ilk tədqiqatlardan etibarən bir çox alimlərin diqqətini çəkmiş və əsərin janrının müəyyənləşdirilməsi üçün hərtərəfli təhlilə ehtiyac olduğunu hiss etdirmişdir. Əsərin realist səpkisi, klassik ənənələrə gətirdiyi yeniliklər H.Əfəndiyev, F.Qasımzadə, Z.Əsgərli və i. tərəfindən Abbasqulu ağa Bakıxanovun novatorluğu kimi qiymətləndirilmişdir. Lakin bütün elmi təhlillərdə "Kitabi-Əsgəriyyə" lirik hekayə kimi dəyərləndirilir. Əsərin mürəkkəb tərkibli dilinin çətinliklərini aradan qaldırdıqda təhkiyənin dili və üslubu, müəllifin hadisələrə və obrazlara

münasibəti daha aydın nəzərə çarpdığından obyektiv təhlilinə nail olmaq mümkündür.

“Kitabi-Əsgəriyyə” əsərində qədim yunan ədəbiyyatının təcrübəsindən qaynaqlanan ənənələrə sadiq qalaraq satira bir janr kimi, yumoristik parodiya isə burada janrın bir əlaməti kimi çıxış edir. Kiçik bir hekayədə ah-nalənin, göz yaşının, şikayətlərin, aşiqin iztirablarının mübaliğəli şəkildə yaratdığı lirizm Füzulinin “Leyli və Məcnun” əsərinin ekspressiv təsirinə parodiya kimi səslənir. Sadəcə inkarın üzərində lirikanın irradiasiyası ikincinin daha çox yadda qalmasına və əsərin lirik hekayə kimi dəyərləndirilməsinə səbəb olmuşdur. Lakin burada parodiya Füzuli sənətkarlığına, eşq fəlsəfəsinə qarşı deyil, “Leyli və Məcnun” əsərinin müstəqim mənasını kənara qoyub məcazını təbliğ edən ədəbiyyata, epiqonçuluğa, cəmiyyətdə eşq fəlsəfəsinin məcazının həqiqət kimi dərk olunmasına qarşı yönəldilmişdir. Müəllifin qəhrəmanlarının emosional hallarının dastanvari qeyri-qəti (“guya mükərrər bu şeiri oxuyub ağlardı”, “guya bu sözləri deyirdi”) və bir qədər də qeyri-ciddi münasibəti (Xülasə, növbənöv nalə və şivən ilə bir-biribdən vida edib, məşuqə səfər qıldı”) bir daha lirik intonasiyanın əsas fon yerinə keçməsi təhlükəsini önləmək məqsədinə xidmət etmişdir.

Təhkiyənin lirik-psixoloji motivlərlə zəngin ironik pafosunu, süjet xəttinin inkişafının komik dramatizmini nəzərə alaraq onu satirik-yumoristik hekayə adlandırırıq. Hekayənin zəngin cəhətlərindən biri də budur ki, burada gülüşün müxtəlif çalarlarından istifadə olunmuşdur. Kinayə ilə yoğrulmuş müəllif təhkiyəsi kolliziyaların toqquşmasında sarkazma çevrilir. Eyni zamanda əsər boyunca aşiqin göz yaşlarının yumoristik təsviri özünü göstərməkdədir ki, bu islahedici gülüş yazıçının öz qəhrəmanına aşiqliyindən dolayı rəğbətindən doğur:

“Xülasə, nə cür olur-olsun, eşq zahiri zərərlərlə nəticələnsə də, tərifə layiqdir.

Müəllif deyir:

“Müşk qoxulu zülfün ətrindən başımız ağrısa da,

Həmişə başda bu ağrı olsa yaxşıdır".

Eşqdən hasil olan saysız-hesabsız mənfəətlərdən başqa, yalnız bunu qeyd etmək kifayətdir ki, eşq insanı bütün alçaq xasiyyətlərin mənşəyi olan dünyanın qeydindən azad edər və aşiqin başında məşuqun xəyalından başqa bir xəyal qoymaz".

"Kitabi-Əsgəriyyə" hekayəsində tənqid özü də müxtəlif formalarda təzahür edir: Müəllif kinayəsi, obrazın öz dili ilə özünü ifşası, hadisələrin qrotestik təqdimi və s. A.Bakıxanov giriş sözündə gizli məqsədlərini ("mafilbal") ağıl sahibləri dəstələrinə ("firqeyi-ülul-əlbabə") bəyan etdiyini və bəsirət sahiblərinin ürəyinin lövhəsinə ("əlvahi-zəmairi-ərbabül-bəsairə") nişanələr qələmini ("qələmi-ə`lam") "yürütmüş" olduğunu açıq yazaraq oxucularını məna yozumunda diqqətli olmağa çağırsa da, bu günə kimi sanki heç kim yazıçının demək istədiklərini eşitməyə çalışmamışdır. Buna görə də əsərin məziyyətləri də məzmunu kimi gizli olaraq qalmaqdadır. Müəllifin adını çəkdiyi "bəyani-mafilbal"ı qaynaqlarda bəlağət elminin üç əsas şaxələrindən biri kimi görürük: "Bəlağət elminin üç əsas şaxələrindən biri kimi tanınan bəyan kateqoriyaları əslində bədii təfəkkürün təməl prinsiplərini önə çəkir və bədii təsvirin cövhəri sayılan xəyal lövhələrini öyrənən bir sahədir. Bəyana aid olan istiarə, təşxis, məcaz, kinayə və eyham rəmzi yozumla çox bağıdır."[68] Hekayədə müəllifin qayəsini ifadə edən ən önəmli vasitə kinayədir ki, mahiyyətini Nəsib Göyüşov izah edərək yazır: "Kinayə bədii təxəyyüldə bir söz deyib başqa mənanı nəzərdə tutur və burada həmin mənaya keçid üçün dəlil olmur".[69] "Kitabi-Əsgəriyyə" hekayəsində müəllif təhkiyəsində kinayə özünü ikili mənalı sözlərin işlənməsi vasitəsilə göstərir.

---

[68] Nəsib Göyüşov. Təxəyyül və rəmzləşmə bədii-estetik düşüncənin qaynağı kimi. Elmi araşdırmalar Bakı, 2003, 1-2, səh. 105. Bu barədə bax: Əsrarül-bəlağət. Əbdülqahir Cürcani. Henri Riterin redaktəsi ilə. İstanbul, 1954, s.561.

[69] Yenə orada, səh. 106.

Əsgərin xarakteristikasını verən yazıçı onu söz arası "şəmaili-dilfirib" adlandırmaqla öz gerçək münasibətini ifadə etməyə çalışmışdır. "Diifirib" həm "cazibəli", həm də "könül aldadan" mənalarına gəlir ki, Əsgərin yalnız zahiri portretini yaradan yazıçı onun cəlbediciliyini də məhz "könül aldadan xasiyyət" kimi görür. Hekayədə "idbar" sözü də məhz ikili mənalılığına görə seçilmişdir. Əsgərin sevgilisinin qardaşı Hüseyn "əxül-idbar" adlandırılmaqla çarəsizliyi cəmiyyətdəki eybəcərliyin bir təzahürü kimi görülür. Müəllif öz açıq fikirlərini pərdələmək üçün birinci mənada "çirkin, kifir, eybəcər", ikinci mənada isə bəxtsizlik, talesizlik, uğursuzluq, düşkünlük, tale dönüklüyü (iqbal ziddi)"[70] mənalarını verən bu sözdən istifadə etmişdir. Hekayədə işlənmiş belə ifadələrin nümunələrini artırmaq mümkündür, lakin daha açıq eyhamlara da təsadüf edirik ki, onların üzərində dayanmağımızı münasib bilirik. Mərsiyəxan olan Əsgərin "ağlamaq peşəsini" onun öz halına müvafiq görən yazıçı Məcnunluq halına parodik olaraq belə ifadə edir: "... bəlkə kəndisinin əvaqibi-ümurun yad edib həmğərini-naləvü əfqan olurdu". Yaxud "ustad" mərsiyəxanın vəfatını onun "həmağuşi-ərayisi-hura və nəş`əyabi-şərabən-təhura" olması kimi ifadə edir ki, bu da mərsiyəxanın o biri dünya haqqındakı təsəvvürlərinə yazıçının istehzasıdır.

Abbasqulu ağa Bakıxanovun eyhamlardan istifadə metodunu başqa bir formada Məhəmməd Füzulinin yaradıcılığında görürük:

"Gözü yaşlıların halın nə bilsin mərdümi-qafil,
Kəvakib seyrini şəb ta səhər bidar olandan sor.

Mərdümi-qafil ikili məna daşıyır: qafil camaat və qafil göz. Bu incə eyhamdır. Göz ilə mərdüm, yəni göz bəbəyi

---

[70] Xeyri əl-Abbasi. "Əxz", "idbar" və "irad" sözlərinin Azərbaycan dilində semantik dəyişiklikləri haqqında. "Elmi araşdırmalar. Bakı, 2003, 1-2, səh. 154. Bu barədə bax:Баранов Х.К.Арабско-русский словарь. Москва, 1976. стр.245.

arasında əlaqə, mərdümi-qafil ilə bidar arasında təzad, göz yaşı ilə kəvakib (ulduz) arasında isə tənasüblik münasibəti vardır. Füzuli şeirində sözlərin ikili mənada işlənməsi və onların arasında gizli və zərif məntiqi əlaqə çox gözəl bədii-rəmzi xəyal lövhələri yaradır"[71]. Eyni sözləri A.Bakıxanovun əsəri haqqında da deyə bilərik. Lakin bu iki mütəfəkkiri fərqləndirən cəhət budur ki, Füzuli iki fikri bir sözlə ifadə edirdisə, Bakıxanov bir fikri iki məna arasında gizləyirdi.

Əsərdə hadisələrin lakonik və dinamik təsviri, ritmik ifadə tərzi, və s. vasitələr əsərin satirik xüsusiyyətlərinin qüvvətlənməsinə xidmət edir.

"Kitabi-Əsgəriyyə" hekayəsinin sadaladığımız xüsusiyyətlərini yalnız klassik ədəbiyyatın poetikasının və İslam təfəkkürünün işığında görmək mümkündür. Buna görə də araşdırmasız sıradan bir oxucuya əsər öz sirrini verməyəcəkdir. XIX əsr ədəbiyyat tariximizdə əhəmiyyətsiz görünən süjet əsasında ictimai qüsurlar avaraçılıq, qeybətçillik, həmçinin, ruhani dairələrdəki cəhalət timsalında tənqid olunur. Bakıxanov bu üslubla yalnız "ülul-əlbab"ın onun gizli məqsədlərini duya biləcəyinə ümid edərək ədəbiyyatımız üçün tamamilə yeni olan bu addımı atmışdır.

"Kitabi-Əsgəriyyə " hekayəsində "zövqəngiz" dillə hər dövr üçün aktual olan çox ciddi ictimai-fəlsəfi problem qoyulmuşdur: cəmiyyəti qanunlar mı, yaxud ənənə mi idarə etməlidir?! Bakıxanovun didaktik əsərlərindən və bir sıra rəsmi məktublarından görürük ki, qanun deyəndə ədib ilk növbədə şəriət qanunlarını nəzərdə tuturdu. Yazıçını narahat edən ikinci bir sual isə bu idi: Şəriət kimlərin əlindədir və ondan hansı vasitələrlə istifadə edilir? Bu sualı Bakıxanov "Kitabi-Əsgəriyyə"də eyhamla qoymuş, Cəlil Məmmədquluzadə "Danabaş kəndinin əhvalatları"nda açıq cavabını vermiş,

[71] Nəsib Göyüşov. Təxəyyül və rəmzləşmə bədii-estetik düşüncənin qaynağı kimi. Elmi araşdırmalar Bakı, 2003, 1-2, səh. 106.

Nəriman Nərimanov "Bahadır və Sona" romanında və Sultan Məcid Qənizadə "Məktubati-Şeyda bəy Şirvani" dilogiyasında problemin bədii-estetik həllini tapmağa çalışmışlar. Ümumiyyətlə, deyə bilərik ki, Bakıxanovun hekayəsinin tematikası XIX əsr bədii nəsrinin polemikasına çevrilmişdir. Sultan Məcid Qənizadə XIX əsrdə mühim problematik məsələlərin bədii-estetik həllinin məhz lirik pafos altında aparıldığını oxucularının nəzərinə çatdırmaq üçün "müəllif qeydi" deyilən bir priyoma da əl atmışdır ki, bunu yalnız "Məktubati - Şeyda bəy Şirvani" əsərinə deyil, həmçinin "Kitabi-Əsgəriyyə" və "Bahadır və Sona" əsərlərinə də aid edə bilərik: "Şeyda bəyin bu cüzv məktubatı eşq dövrəsində dolanıban məcazi yol ilə başa gəldiyinə görə, oxuyanlardan rica olunur ki, məktubatın həzliyyat tərəflərin iğmaz edib ciddən söylənmiş mətləblərini nəzərə alalar".

Firidun bəy Köçərli "Kərbəlayı Səfi "Valeh" təxəllüs" məqaləsində XIX əsrdə bir insanın həyat tarixçəsini ifadə edən "Vücudnamə"yə əsasən erkən evlənmə cəhdlərini təhsilsizliklə, ömrün boş və faydasız xərclənməsiylə bağlayırdı:

"Kərbəlayı Səfinin bu "Vücudnamə"si bizim zindəganlığımızın cümlə övzavü keyfiyyətini və nə növ icra etməsini və adabü ayinini bəyan edir.

Bu kəlamdan məlum olur ki, uşaq ana bətnindən yerə düşən kimi onu duzlayırlar və iki yaşına kimi o, ana südü ilə müdara eləyir. Ancaq üçüncü sənədə vasil olduqda qeyri şeylərin əklinə mübaşirət edir. Beş yaşında ona xütnə olunur. Yeddi yaşa yetdikdə uşağı məktəbə qoyurlar və bir ilin müddətində ancaq oxuduğunu hürufi-müsəvvətə və hərəkələr vasitəsi ilə heca edə bilir. Doqquz-on yaşında hecadan rəvana keçir və on yaşına daxil olduqda gecə və gündüz ənbiya və övliyaların zikri ilə məşğul olur. On birində dərsini və təlimini tamam eləyir.

On beş sinnində həddi-kəmala yetib, fərzü sünnətini başlayır əda etməyə. On yeddi və on səkkizdə namizəd olub arvad alır və iyirmi yaşında övlad sahibi olur.

Necə ki oğlan uşağı cavan sinnində evlənib əhlü əyal sahibi olur, habelə qız uşağı dəxi də səbi ikən vaxtsız və mövsümsüz ərə verilib, cavanlıq mövsümünə daxil və həddi-kəmala vasil olmamış analıq halına düşür və saplağından vaxtsız üzülmüş çiçək kimi hənuz açılmamış soluxur və tezcə qocalıb qüvvət və təravətdən düşür. Müddəti-təlim dəxi çox çəkmir. Yeddi sinnindən oxumağa iqdam edib on birində elmini tamam edir. Bu müddət ərzində uşaq ancaq bacarır ki, Quranı oxusun, peyğəmbərlərin və imamların adlarını əzbərləyib təkalifi-şəriyyəsini filcümlə öyrənsin. Bununla onun elmi qurtarır. Bu sayaq bizim məktəblərdə təlim olunurdu.

Altmış, yetmiş və yüz il bundan müqəddəm həmçinin bu qərar üzrə onlarda dərs və adab öyrənilirdi; bu yavuq vaxtlara kimi. Ancaq bu axır vaxtlarda təzə üsul ilə yeni qayda üzrə təsis olunmuş məktəblərdə bizim balalara təlim verilir"[72] .

Göründüyü kimi, A.Bakıxanovun öz hekayəsində tənqid hədəfinə çevirdiyi ictimai stereotiplər XIX əsrin digər maarifpərvər ədiblərinin də əsərlərində öz etoloji əksini tapmaqla artıq bədii yaradıcılığın problematikasına çevrilmişdir.

[72] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. Bakı, 1978, səh. 332

## A.BAKIXANOVUN "KİTABİ-ƏSGƏRİYYƏ" HEKAYƏSİNİN "RİYAZÜL-QÜDS" MƏQTƏL ƏSƏRİ İLƏ ƏLAQƏSİ

A.Bakıxanovun "Kitabi-Əsgəriyyə" hekayəsinin Məhəmməd Füzulinin "Leyli və Məcnun" əsəri ilə oxşarlığı olduğu kimi özünün "Riyazül-qüds" əsəri ilə də ortaq xüsusiyyətlərini müşahidə etmək mümkündür. Bu eyniyyəti Hidayət Əfəndiyev "Azərbaycan bədii nəsrinin tarixindən" adlı əsərində qeyd edirdisə də, ilk dəfə ətraflı tədqiqata cəlb edən alim Möhsün Nağısoyludur. Əsəri klassik tərcümə nümunəsi olaraq tədqiqat obyekti seçən müəllif "A.Bakıxanovun "Riyazül-qüds" əsəri" adlı tədqiqat əsərində Bakıxanov yaradıcılığında bədii nəsrin xüsusiyyətlərini də nəzərdən keçirmişdir. Buna görə də "Kitabi-Əsgəriyyə" hekayəsinin "Riyazül-qüds" ilə müqayisəli təhlilini Möhsün Nağısoylunun tədqiqatına əsasən veririk. "Riyazül-qüds" əsəri müsəlman Şərqində daha çox Kərbəla vaqeəsi adı ilə tanınan tarixi bir hadisəyə həsr olunmuşdur. İslam aləmində görünməmiş bir müsibət, qanlı faciə kimi dəyərləndirilən Kərbəla vaqiəsi Yaxın və Orta Şərq xalqlar ədəbiyyatında yeni bir mövzunun yaranmasına səbəb oldu və çox keçmədi ki, ərəb, fars və türk dillərində Kərbəla vaqiəsinə həsr olunmuş bir sıra əsərlər ortaya çıxdı. Həm nəzmlə, həm də nəsrlə yazılan, bəzən isə nəsrlə nəzmin növbələşməsi şəklində qələmə alınan bu cür əsərlər, əsasən, "Məqtəl" və ya "Məqtəli-Hüseyn" adı ilə tanınınr. "Məqtəl" ərəb mənşəli sözdür: "qətl" sözü ilə eyniköklüdür və lüğəvi mənasına görə "qətl yeri" deməkdir. Ədəbiyyatşünaslıqda isə "məqtəl" termin səciyyəsi daşıyır və İslamın ən böyük şəhidləri, xüsusilə də, İmam Hüseyn haqqında yazılan əsərlər anlamında işlənir.

F.Köçərli XIX yüzillikdə Azərbaycan ədəbiyyatında İmam Hüseyn müsibətinə dair çoxlu növhə və mərsiyə yazılmasını yerli camaatın bu qəbildən olan əsərlərə daha çox rəğbət göstərməsi ilə izah edir. A.Bakıxanovun gənclik illəri də belə bir mühitdə keçmişdir və heç şübhəsiz ki, "Riyazül-qüds"ün məhz həmin vaxtlar ortaya çıxmasında bu amilin mühüm rolu olmuşdur.[73]

Möhsün Nağısoylu qətiyyətlə belə bir nəticəyə gəlir ki, "Riyazül-qüds" klassik ədəbiyyatımızın bir tərcümə nümunəsidir və Məhəmmədbağır Məclisinin "Cəlaül-üyun" əsərinin əsasında tərtib olunmuşdur. Əsərin tərtibində Hüseyn Kaşifinin "Rövzətüş-şühəda" və Füzulinin "Hədiqətüs-süəda" əsərlərindən də istifadə olunmuşdur. Abbasqulu ağa Bakıxanovun bütövlükdə bədii yaradıcılığına Füzulinin güclü təsiri olduğu üçün tədqiqatçıların hamısı "Kitabi-Əsgəriyyə" hekayəsini təhlil edərkən Füzulinin "Leyli və Məcnun" poeması ilə yanaşı "Hədiqətüs-süəda" əsəri və eləcə də "Riyazül-qüds" ilə də paralellər aparırlar. Hekayənin "Riyazül-qüds" ilə oxşar xüsusiyyətlərini ətraflı təhlilə cəlb etdiyi üçün M.Nağısoylunun əsərindən olduğu kimi təqdim edirik:

"İstər prof. F.Qasımzadə, istərsə də M.Sultanov xüsusi olaraq qeyd edirlər ki, A.Bakıxanov "Riyazül-qüds"dən əvvəl də bədii yaradıcılıqla məşğul olmuşdur. "Riyazül-qüds"ün istər bədii sənətkarlıq xüsusiyyəti ilə seçilən qafiyəli nəsrini, istərsə də nəsr arasında verilən bitkin şeir nümunələrini nəzərə alaraq biz də bu fikrə qoşulur və hesab edirik ki, M.Sultanov "A.Bakıxanov lap gənc yaşlarından ana dilində şeir yazmağa başlamış və bu şeirlərin bir qismini sonradan "Riyazül-qüds"ə daxil etmişdir" mülahizəsində tamamilə haqlıdır. Bunu nəzərə aldıqda A.Bakıxanov Qüdsi təxəllüsünü də, çox güman ki,

[73] Möhsün Nağısoylu. "A.Bakıxanovun "Riyazül-Qüds" əsəri. Bakı, səh. 6, 9, 12

"Riyazül-qüds"ü qələmə almamışdan qabaq qəbul etmiş və ilk öncə lirik şeirlərində onu işlətmişdir." Tədqiqatçının bu fikrini "Riyazül-qüds"də verilən bir nəzm parçası da təsdiq edir:

"Olub tənasüb üzündən təxəllüsüm "Qüdsi",
Ki, cəm`i bir-birə bu rəmzilə müvafiqdir".

Göründüyü kimi, yazıçı özü də təxəllüsünün əsərinin rəmzi adı ilə uyğunluğunu qeyd edir.

"Bu məsələ ilə bağlı onu da qeyd edək ki, "Riyazül-qüds"ün dibaçəsində olan:

Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,
Bülbülü-gülzari-matəm Qüdsiyi-şuridəhal –

beyti müəllifin "Kitabi-Əsgəriyyə" adlı hekayəsində də eynilə vardır". Tədqiqatçı alim bir detalı nəzərdən qaçırıb ki, beytdə işlənən "matəm" sözü "Kitabi-Əsgəriyyə" hekayəsinin mövzusuna uyğun olsun deyə dəyişdirilərək "möhnət" kimi işlənmişdir. M.Nağısoylu davam edərək yazır: "Bu fakt isə belə bir qənaətə gəlməyə əsas verir ki, A.Bakıxanov, ümumiyyətlə, lirik şeirlərini müstəqil şəkildə yazdığı kimi, sonralar onları yeri gəldikcə ayrı-ayrı əsərlərinə də daxil etmişdir. Buna sübut olaraq qeyd edək ki, A.Bakıxanov "Dil eşq yolunda zar olubdur" misrası ilə başlayan doqquz beytlik məşhur qəzəlinin ilk beş beytini bir qədər dəyişdirilmiş şəkildə "Kitabi-Əsgəriyyə" hekayəsinə daxil etmişdir. Maraqlıdır ki, müəllif bu qəzəlin mətlə beytindəki Qüdsi sözünü (təxəllüsünü) "Kitabi-Əsgəriyyə"də baş qəhrəmanın adı ilə əvəzləmişdir. Fikrimizcə "Riyazül-qüds"də verilən aşağıdakı şeir parçası da həmin qəzəlin ilk üç beytinin bir qədər dəyişdirilmiş, fərqli variantıdır"[74].

"Riyazül-qüds"də:

Dil dərd ilə biqərar olubdur,
Ləb ah ilə pürşərar olubdur.

[74] Möhsün Nağısoylu. "A.Bakıxanovun "Riyazül-Qüds" əsəri. Bakı, səh. 31-32

Qan rəngi dutub üzari-zərdim,
Həngami-xəzan bahar olubdur.
Dövrani-fələk cəfalər eylər,
Can düşməni ruzigar olubdur.

“Kitabi-Əsgəriyyə”də:
Sənsiz dili-xəstə zar olubdur,
Bimunisü qəmgüsar olubdur.
Xunabə tutubdu rəngi-zərdim,
Bu gülşən üçün bahar olubdur.
Xunin cigərim bə sani-lalə,
Əfsürdəvü dağidar olubdur.
Hicran sitəmi alıb qərarim,
Gün nuri gözümə tar olubdur.
Hicrində düşüb bəlayə Əsgər,
Sərgəştəyi-ruzigar olubdur.

“Müqayisə üçün şairin divanındakı həmin qəzəlin də ilk üç beytini veririk:

Dil eşq yolunda zar olubdur,
Bir gül həvəsində xar olubdur.
Xunabə dönübdü rəngi-zərdim,
Bu gülşən üçün bahar olubdur.
Dövrani-fələk müxalif olmuş,
Can düşməni-ruzigar olubdur.

Göründüyü kimi, qəzəlin son iki beyti ilə “Riyazül-qüds”dəki şeir parçasının müvafiq beytləri arasında açıq-aşkar bir yaxınlıq vardır. Bunlardan hansının birinci yazılmasını qəti söyləmək, təbii ki, çətindir.

Yeri gəlmişkən, bu məsələ ilə bağlı daha bir maraqlı faktı qeyd etmək istəyirik. A.Bakıxanovun “Riyazül-qüds” və “Kitabi-Əsgəriyyə” əsərlərini müqayisə edərkən məlum olur

ki, birincidə olan üç şeir parçası eynilə müəllifin ikinci əsərində də vardır. Həmin şeir parçasından ikisi "Riyazül-qüds"də imam Hüseyn(ə) haqqındakı beşinci babdadır. Onlardan birincisi İmamın (ə) qızı Səkinənin dilindəndir:

Yetim olan kəsə, əlbəttə, qəmgüsar olmaz,
Zəlili-aləm olur, izzü etibar olmaz.
Bəlalər içrə qalur dərbədər, dəmi keçməz
Ki, bağrı qanə dönüb didə əşkbar olmaz.

Bu şeir nümunəsi "Kitabi-Əsgəriyyə"də tam eyni şəkildə Əsgərin müəlliminin dilindən verilmişdir.

"Riyazül-qüds"dəki ikinci şeir nümunəsi İmam Zeynalabdinin (ə) dilindəndir:

Bülbül necə gülzar ətəgindən əlin üzməz,
Şivən dili-bimar ətəgindən əlin üzməz,
Qanilə boyar səfheyi-rüxsarimi gül-gül,
Dil dideyi-xunbar ətəgindən əlin üzməz.

Bu nümunə "Kitabi-Əsgəriyyə"də Əsgərin dilindəndir və eynilə bu beytlərlə başlanır və daha üç beytlə davam etdirilir.

Üçüncü nümunə isə "Riyazül-qüds"ün xatimə hissəsində olan aşağıdakı şeir parçasıdır:

Əlhəmdü li vahibül-ətiyyə,
Vəşşükr li xaliqül-bəriyyə...
Kim, xameyi-mişkbarim etmiş,
İzhari-məratibi-əliyyə.
Bir türfə kitab edib mürəttəb,
Əhbab üçün etmişəm hədiyyə.
Şayəd ki, vəsileyi-nicatım
Olsun bu ümuri-mə`nəviyyə.

Bu misraların da hamısı eynilə "Kitabi-Əsgəriyyə"nin sonundadır. "Kitabi-Əsgəriyyə"də yuxarıdakı sonuncu beytdən əvvəl bu beyt də vardır:

Tovfiqi-səadətilə olmuş,
İtmam: "Kitabi-Əsgəriyyə".

Bu fakt A.Bakıxanovun öz qələminin məhsulu olan eyni lirik şeirlərindən müxtəlif əsərlərində istifadə etdiyini sübut edir. Qeyd edək ki, digər klassik sənətkarların əsərlərində də bu cür oxşar hallara rast gəlirik. Məsələn, məşhur İran şairi Sədi Şirazi bir sıra lirik şeirlərini sonradan müəyyən düzəlişlə "Gülüstan" əsərinə daxil etmişdir. Eləcə də M.Füzulinin "Hədiqətüs-süəda" əsərində olan şeir parçalarının bəziləri azacıq fərqli şəkildə şairin divanında da vardır"[75]. Möhsün Nağösoylu "Riyazül-qüds" əsərinin bir tərcümə nümunəsi olmaqla yanaşı sərbəst yaradıcılıq xüsusuiyyətlərini vurğulayaraq sənətkarlıq baxımından da yüksək qiymətləndirir. Bədii əsər kimi də diqqətəlayiq sənət nümunəsi hesab edir: "Riyazül-qüds", xüsusilə də, bədiyyat baxımından mükəmməl bir sənət əsəridir və bu yöndə ayrıca bir araşdırma mövzusu ola bilər[76].

[75] Möhsün Nağısoylu. "A.Bakıxanovun "Riyazül-Qüds" əsəri. Bakı, səh. 33-34

[76] Yenə orada, səh.147

# “KİTABİ-ƏSGƏRİYYƏ” HEKAYƏSİNİN BƏDİİ İFADƏ SİSTEMİ

Yazıçının həyati-estetik mövqeyi öz əksini bədii əsərin obrazlar sistemində, insan həyatının konkret şəkillərinin təsvirində, tipik xarakterlərin, müsbət qəhrəmanın obrazında, təsvirlərdə, nəhayət, müəllif obrazında tapır. Bütün bu xüsusiyyətlər yazıçının həyati-estetik mövqeyi, onun yaradıcılıq metodu, fərdi üslubu və onunla yanaşı həqiqətin onun əsərində əksini tapan tərəfləri ilə əsaslandırılır. Epik növün ən kiçik və ən təsirli janrı olan hekayənin ideya ekspressiv təhlilini verərkən ilk növbədə onun nitq stukturunu nəzərdən keçirmək zərurəti duyulur. Epik növün bütün janrları kimi, hekayədə də nitq sistemi, bir tərəfdən , təhkiyəçi obrazı ilə müəyyənləşir, digər tərəfdən isə - qəhramanların daxili aləmindən, onların şüjetdəki vəziyyətləri ilə şərtləndirilmiş vəziyyətindən, onların fərdi psixoloji, mədəni, sosial simalarından asılıdır. Bütün bunlar əsərin leksikasını, frazeologiyasını, hər bir bitmiş epizodun intonasiya düzümünü, səhnələri və bütövlükdə onların strukturunu müəyyənləşdirir. A.Bakıxanovun “Kitabi-Əsgəriyyə” əsəri də ana dilimizdə yazılmış ilk maarifçi-realist əsər kimi lirik intonasiyanın müşaiyət etdiyi satirik üslubu ilə geniş təhlillərə imkan verən bir sənətkarlıq nümunəsi olaraq diqqətəlayiqdir. Hekayə dili, üslubu baxımından, həm də ədəbiyyatımızda təhkiyənin inkişafı nəzər nöqtəsindən yeni nəsrin gələcək inkişafı üçün ümidverici əsərdir. “Kitabi-Əsgəriyyə” yazılma dövrünə görə tarixin elə bir qovşağında meydana gəlmişdir ki, klassik ənənələrlə müasir stereotiplərin qaynaqlanma prosesi başlanmışdır. Mədəni-mənəvi fəaliyyətlərin bütün sahələrində olduğu kimi, ədəbiyyatımızda da mühafizəkar, novator və islahatçı tendensiyalar müşahidə edilməkdə idi. Abbasqulu ağa

Bakıxanovun bütövlükdə bədii yaradıcılığında bu mövqe axtarışlarını müşahidə edirik ki, "Kitabi-Əsgəriyyə" hekayəsini bu yolda yazıçının bədii-estetik konsepsiyası kimi dəyərləndirə bilərik.

Əsərin giriş hissəsi dastan və klassik eposlara xas "Dibaçə" şəklində proloq kimi səslənərək müəllifin qələmə aldığı hadisəyə subyektiv münasibətini ifadə edir. Bununla da əsər boyunca müəllif obrazı aydın görünür və müəllif təhkiyəsi subyektivliyini əsərin sonuna qədər qoruyub saxlayır. Hekayədə təhkiyəçi kimi yazıçı özü çıxış edir və hadisənin şahidi kimi əsərinin qəhramanlarına tərəfdarlıq göstərir ki, bununla da aydın müəllif obrazını da formalaşdırmış olur. Müəllif əsərin əvvəli və sonunda bunu açıq tərzdə bəyan edir:

"Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,
Bülbüli-gülzari-möhnət Qüdsiyi-şuridəhal

bu rəsmi-dilaviz ilə firqeyi-ülul-əlbabə bəyani-mafilbal etmiş" (Dərd həbsxanasına bağlanmış, qəm-qüssədən üzülmüş, möhnət bağının bülbülü hali-pərişan Qüdsi bu gözəl üslubla ağıl sahibləri dəstəsinə gizli məqsədlərini bəyan etmiş). Göründüyü kimi, yazıçı öz halını da izhar etməklə qəhramanlarının vəziyyətini daha yaxından hiss etməsini də nəzərə çatdırır. Hekayəni nəql edib bitirdikdə isə təhkiyəçi onların sonunun nə ilə bitəcəyini hələ bilmədiyini də izhar edir və bununla da hadisənin gerçək şahidi olduğunu bir daha təsdiq etmiş olur:

"Ümidvaram ki, inşaallah-təala ənqərib peyvəndi-müvasilət aralarında vaqe olub, ədayi-təhniyət qılıb, mübarəkbad edim ol məzmunə nüsxeyi-cədid inşa qılım:

İlahi, bu duamı müstəcab et,
Hüsuli- mətləbi-feyz intisab et".

Müəllif Allah təaladan qəhramanlarının xeyrinə duasının qəbul edilməsini və faydalı istəklərin hasilini nəsib etməsini arzulayır ki, bu məzmunda da yeni bir əsər daha qələmə alsın.

Təhkiyəçinin nitqi yazıçının təhsil və savad dərəcəsinin göstəricisi olaraq klassik nəsr və ədəbi dili üslubundadır və bunu da yuxarıda qeyd etdiyimiz kimi, "gözəl üslub" adlandırır.

Əsərdə təhkiyənin tipi kimi, müəllifin qələmə aldığı mövzuya münasibəti tamamilə subyektivdir. Təhkiyəçi mövqeyini müdafiə etdiyi qəhramanlarının öz mübarizələrində seçdikləri yolu sanki oxucusunun mühakiməsinə buraxır. Amma öz subyektiv münasibətini lirik ricətlərdə yenə də oxucusuna xatırlatmaqdan qalmır. Əsgərin rastlaşdığı maneələri yeri gəldikcə hiylə yolu ilə aşa bilmək cəhdini ilk baxışda öz təhkiyəsində tamamilə münasibətsiz buraxır:

"Dedi:

- Ey yari-mehribanım! On şahi pul sənə verim, amma məni rədd etmə, hər vaxt gəlib ol məbləği mütalibə etsəm, bir bəhanə ilə təxir et. Bəlkə bu vəsilə ilə bir-birimizi görmək müyəssər ola.

Cümləsi bu rəyi dürüst qəbul edib bir müddət dəxi ovqat keçirdilər."

Bir beytlə isə verilmiş qərara özü bir müşahidəçi kimi yanaşaraq qəhrəmanlarının öz düşüncələri tərzində haqq qazandırır:

"Aşiqdə gərək fünuni-hiylə,
Ta eyləyə vəsl üçün vəsilə".

Yazıçı burada yalnız öz fərdi münasibətini deyil, "fünuni-hiylə" ifadəsi altında daha dərin bir mənada münasibəti ifadə edir. Hekayənin əvvəlində də qeyd etdiyi kimi, "bəyani-mafilbal" deyə adlandırdığı bir çox mətləbləri kəlmələr içində gizlədərək "ərbabül-bəsairə" (gizlinləri görən dostlara) çatdırır.

Böyük ehtimalla deyə bilərik ki, "fünuni-hiylə" ifadəsi din tarixində özünə mühüm bir yer qazanmış bir rəvayətə işarədir:

"Malı və mülkü gedən, övladlarının hamısı vəfat edən Həzrət Əyyub sadəcə xanımı Rəhimə qalmaqda, xidmətində o

durmaqdadır. Zaman gəlmiş, Rəhimə başqalarının ev xidmətini görərək əldə etdiyi ücrətlə keçim sıxıntısını yumşaltma yolunu tutmuşdur və bir gün onun evdə olmadığı məqamda bir neçə dəfə səslənən Həzrəti-Əyyub cavab almadıqda xəstəliyin və çarəsizliyin verdiyi sıxıntı içində "şayət Allah şəfa verərsə, Rəhiməyə yüz zopa vurmaq üzərinə" yəmin edir. Halbuki bu vəziyyətdə Rəhimənin belə bir cəzaya layiq olacaq işlədiyi günah yox idi.

Həzrəti-Əyyub şəfa tapdıqdan sonra ilk olaraq yəmini yerinə yetirməyi istədi. Fəqət ona illər boyu yorulmadan, şikayətlənmədən şəfqət, mərhəmət və səmimiyyətlə Allah rizası üçün xidmət etmiş bir xanımın mükafatı bu olmamalıydı. ..Bu dəfə Allahü təala özü hakim oldu. Həzrəti-Əyyuba "əlinə bir dəmət al və onunla vur" əmrini verdi.

Həzrəti-Əyyub yüz dənə əkin sapını bir yerə topladı, dəmət düzəltdi, bağladı, yəminini yerinə yetirmək üçün xamımı Rəhiməyə vurdu. Beləcə məsələ həlledilmiş oldu... Fiqh tarixinə bu hököm "Əyyub Ruhsatı" adıyla daxil olmuşdur". Bu hökmə əsaslanaraq bəzən çıxılmaz məsələləri "hiyleyyi-şəriyyə" kimi həll etmək cəhdləri dində bu günə kimi görünməkdədir.

Hekayənin razvyazkası (Əsgərin yuxuda ustadını görüb onun razılığını alması) da məhz "fününi-hiylə" yolu ilə həll edilmişdir ki, burada da müəllif olub bitənlərə zamin deyil, o, sadəcə, nağıl olunanları oxucusuna olduğu kimi söyləməkdə məsuldur. Bütün bunları o, Əsgərin özündən eşitdiyini hadisənin davamında diqqətə çatdırmaqla gerçəkçiliyini sanki zəmanət altına almağa çalışır:

"Nagah bir ğəmmazi-süxənçin bu surəti-macəranı əla macəra varıb ol məhəllə rəisinə  mə`lum etdi. Ol rəis dəxi müvəkkillər təyin etdi ki, hər yerdə ol aşiqi –dilxuni görsələr tutub işgəncəyi-siyasətə yetirsinlər. Əsgəri-müztərdən nəqldir ki:

- Çün rahi-çarə hər tərəfdən məsdud oldu və rəis ilə saziş etməkdən başqa çarə görmədim və dedim:

Zülmü gör kim, ayrılıqdan canə yetdim aqibət,
Çarəsiz qaldım varıb əğyarə könlüm bağladım.

Axirül-əmr bir gün əlimə bir parə nan alıb üstündə rövğəni-kərə tışrə çıxdım. Rəisi-məzkur mənə düçar olduqda təarif ilə ona verib dedim:

- Əgər həqqi-ne`məti fəramuş edib, mənə təərrüz qılsan, bu nan gözlərini tutsun və səmumi-küfrani-ne`mət gülşəni-ömrünü xəzan etsin."

Nümunələrdən göründüyü kimi, əsərin təhkiyə dili ilə personajların dili ədəbi quruluşuna görə fərqlənir və həmçinin şəraitdən asılı olaraq həm müəllif təhkiyəsi, həm də personajların nitqi dəyişir. Müəllif dili lirik-publisistik ricətlərdə ibarəlidir, amma hadisələrin təsvirində daha sadədir. Əsgər Ahəngərzadə bir ruhani nümayəndəsi olduğu üçün onun nitqi pafosu ilə digər personajlardan fərqlidir və hər kəslə onun mənsub olduğu zümrənin dili ilə danışır. Əsərdəki qadın obrazı da xarakter və nitq etibarilə real və səmimidir. Öz narahatlığını və qəzəbini ifadə edəndə daha sadə və millidir:

" – Ya əkəllülhələvat! Ey atacan! Bir baş qəbirdən götür! Biz pərişanrüzgar, tirəbəxtlərə nəzər qıl! Bivəfa ərdəbillilər əlində necə zarü sərgərdan qalmışıq!"

" - Ah ! Qardaş, kaş sənin kimi naxələf ölə idi, bu günləri görməyə idi" .

Lakin daha mühüm məsələlər sevgililər arasında da yüksək ədəbi dil səviyyəsində aydınlaşdırılır. Ayrılıq məqamından sonrakı görüşdə söhbətləri də lirik xarakterə malik olduğu üçün patetikdir. Abbasqulu ağa Bakıxanov daha çox kiçik səhnələr vasitəsilə qurduğu süjetdə obrazların danışıq psixologiyasının incəliklərinə vararaq dolğun xarakterlər yaratmağa müvəffəq olmuşdur.

Bədii nəsrin janrını şərtləndirən əsas amillərdən biri kimi xronotop "Kitabi-Əsgəriyyə" hekayəsinin həm də realizmini şərtləndirir. Hekayədə zaman ünsürü iki aspektdə görünür. Ümumi zaman aspekti yazıçının yaşadığı dövrdür, konkret

zaman kəsiyi kimi bahar fəslini görürük: "Bir gecə kim, dünyanı bəzəyən gəlin mehri-ənvari—zülməti-şamdan zülfi-mişkin rüxsarinə hideyi-rübdə aram buldu və qəmər ay qonaqlıq məclisi tərtib edib ki, gecə qaranlığını günün qeyrəti və Leylinin çöhrəsi kimi bəzəkli edib fələklər səyyarında qızıl-gümüşdən təbəqlər doldurub dağıtmaq üçün hazır elədi:

Mehr oldu büsati-çərxdən dur,
Mah aldı əlinə şəmi-kafur.
Bir türfə şəbü xücəstəfərcam
Onun kimi görməmişdi əyyam.
Novruz günündən ol füzun qədr,
İzzətlə misali-leylətül-Qədr.

Göründüyü kimi, hadisənin zamanı bir az daha konkretləşdirilərək onun Novruz bayramından bir qədər keçmiş, yəni Ramazan ayında Qədr gecəsinə qədər olan bir müddətdən sonraya aid edilir. Məlum olduğu kimi, Qədr gecəsi Ramazan ayının son on gününün içində olan bir gecədir ki, bununla da Novruz bayramından təxminən on gün sonra nəzərdə tutulmuşdur. Eyni zamanda, zamanın təsvirində Bakıxanovun astronomik bilikləri də öz əksini tapmışdır: Günəş yer kürəsindən uzaqlaşdı –"Mehr oldu büsati-çərxdən dur", ay ekvatora yaxınlaşdı -"Mah aldı əlinə şəmi-kafur"( kafur – ekvatordakı ölkələrdə bitən bir ağac, çox işıq verən şam).

"Kitabi-Əsgəriyyə" hekayəsinin realizmini şərtləndirən amillərdən biri də konkret məkan ünsürüdür. Əsərdə təsvir olunan hadisə Quba şəhərində, daha konkret olaraq isə, "ərdəbillilər" məhəlləsində baş verir. Əsgərin ustadı olan mərsiyəxan "ərdəbillilər" məhəlləsində yaşayır və bu məhəllənin məscidində mərsiyəxanlıq edir. Əsgər isə bu məhəllədən kənarda yaşayır. Əsərdə məhəllənin real təsvirini də görə bilirik: "Bilmərrə səbr ətəyindən əlini üzüb ayrılığa tab etmədi və görüş xoşbəxtliyinə ərizəçi olub bir müddət sonra yenə müraciət edib cananın məhəlləsinə qonşu olmaq istədi. Şəhərin kənarına

yetdikdə aşiqi-məhcur ah çəkməkdən gül üzü xəzan yarpaqlarıtək saralmışdı və müsibət yükünün ağırlığından yaraşıqlı qaməti bükülmüşdü”. Tarixi faktlar da Quba şəhərində “ərdəbillilər” məhəlləsindən və bu məhəllənin məhz şəhərin girəcəyində yerləşməsindən xəbər verir: “Yadigar qalmış vərəqparələrdən və təvarixdə görünən müxtəsər əhvallardan belə məlum olur ki, Quba şəhərini Nadir şah tarixi-hicriyyənin 1147-ci sənəsində - ki, miladın 1734-cü sənəsinə mütabiqdir, - bina etdirmişdir. Müşarileyh Şabrandan (Quba uyezsdində Dəvəçi mahalıdır) gəlib keçdikdə Dərbənd ilə Şabranın arasında “Gülüstani-İrəm” adında basəfa bağlıqda istirahət üçün sakin olmuşdur.

Buranın abü havası şaha xoş gəldiyindən Mirzə Mehdi xan Münşi təvəssütü ilə əmr etmişdir ki, burada şəhər binası qoyulsun. Bu əmri icra etmək üçün bir neçə nəfər öz qoşunundan – ki, Ərdəbil şəhərindən var imişlər, - o məkanda qoyur. O cəhətə şəhərin əvvəlinci məhəlləsi indilikdə də “Ərdəbil məhəlləsi” adı ilə məşhurdur”.(F.Köçərli). Hekayədə adı çəkilən məscid və qəbirstanlıq məkan ünsürünün detallarıdır.

Abbasqulu ağa Bakıxanovun “Kitabi-Əsgəriyyə” əsərinin yuxarıda sadaladığımız ciddi sənətkarlıq məziyyətlərinə baxmayaraq, ana dilimizdə ilk müasir hekayə kimi nəsrimizin bədii inkişafına təsirindən danışmaq üçün hələ ki əlimizdə tutarlı dəlillər yoxdur. Bunun üçün hekayənin öyrənilməsi istiqamətində işlər davam etdirilməli, əsərin əlyazma nüsxələri və dərc olunduğu məcmuələr üzə çıxarılmalıdır ki, bəlkə bu işlər sayəsində də təsir dairəsini müəyyənləşdirmək mümkün olsun.

# “KİTABİ-ƏSGƏRİYYƏ” HEKAYƏSİNİN PROBLEMATİKASI XIX ƏSR AZƏRBAYCAN ƏDƏBİYYATI TARİXİ KONTEKSTİNDƏ

Ədəbiyyatşünaslığımızda realist bədii nəsrin banisi mövzusunda günümüzə qədər davam etdirilən mübahisələrdə irəli sürülən - ”Kitabi-Əsgəriyyə”də XIX əsrin birinci otuzilliyində Azərbaycan həqiqətləri, bu xalqın milli xüsusiyyətləri öz realist əksini tapmamışdır” (N.Məmmədov), “Kitabi-Əsgəriyyə” bir bədii əsər kimi XX əsr realist Azərbaycan hekayəsi ilə nə şəkli, nə də məzmun və quruluş cəhətdən əlaqədar deyildir”(Altay Məmmədov) kimi mübahisəli tezislərin təkzibi üçün Abbasqulu ağa Bakıxanovun bədii əsərlərinin mövzusunu XIX və XX əsrlər ədəbiyyatımızın tematikası kontekstində nəzərdən keçirmək zərurətini duyuruq.

“Dövrün ruhu və hər millətin təhsili həmişə ədəbiyyatda və digər abidələrdə öz əksini tapır” deyən Abbasqulu ağa Bakıxanov idealist baxışları sayəsində daha çox klassik ədəbi ənənələrlə əlaqələndirilən bədii yaradıcılığında məhz zamanın real həqiqətlərinə sadiq qalmağa, dövrünün, mühitinin əhval-ruhiyyəsini əks etdirməyə çalışmışdır. Bakıxanov üçün bu gün keçmişin arasıkəsilməz davamıdır və onun idealizmi dünyada mövcud olan, eyni zamanda daim dəyişən fikir axınlarının təqibində əbədiyyətə qovuşacaq bir həqiqətdir. Buna görə də, A.Məmmədovun tezisinə qarşı çıxaraq deyə bilərik ki, ədəbiyyatda tematikanın arasıkəsilməz, eyni zamanda ümumbəşəri bir prosesdir. Hətta ən qədim yazılı bədii nümunəmiz olan “Avesta” belə bu gün üçün əhəmiyyətini itirməyibdir.

A.Bakıxanovun realizmi mənbə kimi Füzuli təfəkkürünə dayanaraq, M.F.Axundov bədii-estetik fikrindən süzülərək XX əsr tematikasına qovuşur.

A.A.Bakıxanovun “Kitabi-Əsgəriyyə” hekayəsinin M.F.Axundovun “Aldanmış kəvakib” povesti ilə paralellik apardıqda oxşar bədii detallara təsadüf edirik. Hər iki əsər arasında oxşar zahiri əlamətlər olmaqla yanaşı, dərin ideya bağları da mövcuddur. “Kitabi-Əsgəriyyə” hekayəsinin əsas qəhramanı Qubalı cavan mərsiyəxan Əsgər Ahəngərzadədir ki, soyadının göstərdiyi kimi o bir sadə zəhmət adamının – dəmirçinin oğludur. M.F.Axundovun qəhrəmanı isə Yusif Sərracdır ki, “Qəzvinin qəryələrindən Kərbəlayi Səlim adlı bir dehqanın oğlu idi. Çünki Kərbəlayi Səlim bir mömin və müttəqi adam idi, istədi ki, oğlu molla olub üləma silkinə daxil olsun”[77]. Əsgər Ahəngərzadə “üləma silkinə” mənsub olmaq üçün ustadı mərsiyəxandan dərs alırdısa, “Yusif Sərrac ki, həddi-büluğa yetişib asari-rüşd özündə mülahizə elədi, təhsili-elm üçün İsfəhana getdi. Oradan dəxi bir neçə ildən sonra Kərbəlayə rəvanə olub böyük alimlərin məclisində təkmili-ülumə şüru etdi”[78]. Ahəngərzadə Əsgər də öz hesabilə böyük adamların məclisində - “məcməi-əkabir”də “kəsbi-təəllüm edərdi”, lakin bu böyüklər məclisi mərsiyəxanlardan ibarət idi. Hekayənin məzmunundan anlaşıldığı kimi, Əsgər öz mühitinin müti nümayəndəsidir. Lakin Yusif İslam elmlərinə vaqif olsa da, “üləmanın əksəri-ümurda təqəllübünü müşahidə edirdi, ona binaən bu sinfə nifrət bəhəm edib, istəmədi ki, özünü onların zümrəsinə daxil etsin”. Yəni alimlərin əksər işlərdə fırıldağını gördüyü üçün bu yolda halal qazana bilməyəcəyini müəyyən edib sənət yoluna üstünlük verir. Beləliklə, Həmədanda usta Xəlilin yanında sərraclıq sənətini bir il müddətinə öyrənib Qəzvinə qayıdır. “Kəmalüddövlə məktubları” müəllifinin Yusif Sərrac obrazının simasında həm imanlı, həm də islahatçı bir qəhraman yaratması məqsədi əsərin öz mühitində yayılması arzusundan doğurdu ki, XIX əsr

---

[77] Mirzə Fətəli Axundzadə. Əsərləri, I cild, Bakı, 2005, səh.196
[78] Yenə orada, səh.196

Azərbaycanında yalnız belə bir sima uğur qazana bilərdi. M.F.Axundov Yusif Sərracı taxta çıxartmaqla yaşadığı mühitin din adına yazılan özbaşınalıqlarını bəyan etmək üçün öz fikirlərinin tribununa çevirdi. Yusif Sərrac öz islahatlarını "təcvizi-şəri-şərif" ilə, yəni müqəddəs şəriətin icazəsi ilə həyata keçirirdisə də, bu məqamda müəllifin səmimiyyətinə güvənməmək üçün əlimizdə tutarlı dəlillər də var. M.F.Axundov "Kəmalüddövlə məktubları"nın nəşri barədə İsakova ünvanladığı 12 fevral 1875-ci il tarixli məktubunda yazırdı: "Siz əsərin rusca nəşrinə öz tərəfinizdən müqəddimə əlavə edə bilərsiniz və onda göstərə bilərsiniz ki, İslam dini meydana çıxan gündən hazırkı əsrə qədər Şərqdə elmlərin durğunluğunun, dəhşətli despotizmin əmələ gəlməsinin səbəblərini və ümumiyyətlə, asiyalıların mədəniyyət və tərəqqi işlərinə qarşı laqeydliyi və etinasızlığının səbəblərini heç kəs başa düşməmişdir. Bu cəhətdən təkcə Firdovsi müstəsnalıq təşkil edir və öz dühası ilə, həqiqətən, kəşf edə bilmişdir ki, Şərq xalqlarının bu günə qədər böyük bədbəxtliyinin səbəbi ərəblər və onların insan həyatına uyğunlaşmayan mənfur dinidir. Firdovsi isə onu dövründə əhatə edən müasirlərin müdhiş fanatizmi vasitəsilə sıxışdırıldığına görə öz fikrini ehtiyatla, guya öz əqidəsi kimi deyil, ərəb ordularına qarşı vuruşlarda sonuncu İran şahı Yəzdgürdün sərkərdəsi olan Hürmüzd şah oğlu Rüstəmin əqidəsi kimi vermişdir. Məhz buna görə də, Firdovsinin əqidəsi bizim günlərə qədər mütəfəkkirlərin diqqətini özünə cəlb edə bilməmişdir. Yalnız Kəmalüddövlə hazırkı əsrdə Firdovsinin fikrini başa düşərək onu parlaq bir şəkildə inkişaf etdirmişdir" [79]. Məktubdan göründüyü kimi, M.F.Axundov Firdovsini də öz ideyasının tərcümanına çevirərək məqsəd və məramını mümkün qədər üstüörtülü ifadə etməyə çalışmışdır. Bu xüsusda M.F.Axundovla A.Bakıxanov arasında da

[79]Mirzə Fətəli Axundov. Əsərləri. Cild, Bakı, səh. 310.

müəyyən fərqlərlə böyük bənzəyişlər də müşahidə edirik (Burada biz M.F.Axundovla Abakıxanovun dini baxışlarını eyniləşdirmirik.). Axundovun öz qəhrəmanına dini xüsusda getdiyi güzəşti Bakıxanov da gəlir mənbəyi xüsusunda Əsgərə güzəştə getməli olur. Mərsiyəxanlıq XIX əsrdən etibarən böyük qazanc mənbəyinə çevrildiyi üçün İslama zərbə vuran bir bəla kimi ziyalıların müayinəsindən keçirilsə də, hakim zümrənin mənafeyinə qarşı açıq çıxış etmək hələ Bakkıxanovun qüvvəsi daxilində deyildi. Buna görə də Axundovdan fərqli olaraq, Bakıxanov özünün ifadə etdiyi kimi, "nişanələr qələmi yürütməklə" Əsgəri eyhamlarla iynələyirdi.

C.Məmmədquluzadənin "Danabaş kəndinin əhvalatları" povestində də "Kitabi-Əsgəriyyə" hekayəsinin ələ aldığı tematika süjet xəttinin əsas fəqərələrindən birini təşkil edir. Mövzunun inkişafını "Danabaş kəndinin əhvalatları" povesti ilə nəsr ədəbiyyatımızın tarixinin növbəti ilk səhifələrindən izləyə bilirik (Xudayar bəy – Zeynəb, Vəliqulu – Gülsüm ).

"Kitabi-Əsgəriyyə"də Əsgərin atası evli olduğu halda oğlunun sevgilisinin anası ilə izdivaca cəhd göstərdiyi kimi Xudayar bəy də öz nikahlı qadınının üzərinə mərhum dostu Heydərin xanımı, həmçinin qızının beşikkəsməsi olan Vəliqulunun anası Zeynəbi günü gətirir.

Abbasqulu ağa Bakıxanovun müasirlərindən biri olan "Gəncənin adlı şairlərindən" Ağaismayıl Zəbih də öz dövründə ruhaniliyin fırıldaqçılar əlində gəlir vasitəsinə çevrilməsini mərsiyəxanlıq timsalında tənqid hədəfinə çevirmişdir:

Zakir ilə Vaiz  o taydan gəlir hər dəm,
Zakirliyə möhkəm.
Arşın yarım ağ ilə olub cümlə müəmməm[80]

[80] əmmaməli

Ol ömürləri kəm.
Sirab ola bilməz bunları cud ilə Hatəm,
Dinar ilə dirhəm.
Eyvah, yaxın oldu yenə mahi-məhərrəm,
Tutmaqlığa matəm.
Məmlüvv edəcək mənbəri kirpilə ilanlar,
Bu mərsiyəxanlar.

Firidun bəy Köçərli Ağa Ismayıl Zəbihin müstəzadının bu bəndini təhlil edərək yazırdı: "Xətti-kəlamda şair məhərrəm ayında İrandan gələn əqrəbsənət və marsirət vaiz və mərsiyəxanları zikr edib onların tamahkarlığından və biçarə fəhlələri, dərvişləri, əfsungərləri, dəllək və camədarları soyub çapovulçuluq edən nabəkar konsul nayiblərinin cövründən dadü fəryad edir. Bundan məlum olur ki, İranın viran olmağı və onda əlan müşahidə olunan binizamlıq və ədalətsizlik xeyli zaman bundan müqəddəm başlanıbdır"[81]. Abbasqulu ağa Bakıxanovun eyhamlarla yazdığı "Kitabi-Əsgəriyyə" hekayəsində "ərdəbillilər" məhəlləsini tənqid obyektinə çevirməsi də məhz İranın o "binizamlığının" Azərbaycana təsirinin ifadəsini ədəbiyyat tariximizdə bir qədər daha arxaya çəkmiş olur. F.Köçərli Zəbihin müstəzadını "Molla Nəsrəddin" jurnalına ən münasib və onun məsləkinə yaraşan mənzumələrdən biri" kimi dəyərləndirir və qeyd edir ki, "Zəbih öz əsrinin Mirzə Ələkbər Sabiri olub. Əfsus ki, onun da qədri bilinməyibdir və əşarına rəvac verən olmayıbdır". F.Köçərli Zəbihin müxəmməsindən bir bəndinin məzmununu Əbdürrəhim bəy Haqverdiyevin "Molla Nəsrəddin" jurnalında dərc etdirdiyi "Cəhənnəm məktubları"nı yada saldığını qeyd etmişdir.

"Müxəmməsi-Zəbih:
Neçə kəslər var ki, müsəlmandır deyirlər adına,
Şeytənət fikrindən özgə şey düşməz yadına,

[81] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. I cild, Bakı, 1978, səh. 531.

Çox kəsin baisdir onlar fitnəvü əfsadına,
Görcək İblis onları söylər tamam övladına:
Getməyin bu şəhrə kim, bu şəhr şeytan istəməz".

Daha sonra F.Köçərli yazırdı: "Bizim elmi-mərifətdən bibəhrə olan əhlin şeytandan artıq fitnəkar, şərir və fasid olmağını binəzir şairimiz Abbas ağa Qaibov "Nazir" təxəllüs təzə yazdığı "Molla və Şeytan" hekayəsində gözəl vəch ilə bəyan edibdir"[82].

Eyni realist tendensiyanı bütün bunlardan əvvəl XIX əsrin ilk onilliklərində Abbasqulu ağa Bakıxanovun nəzmində və nəsrində izləyirik. O, "Təbriz əhlinin şənində bir neçə qılıncdan kəskinraq şeirlər yazmışdır" (F.Köçərli) ki, onlardan ən məşhuru "Təbriz əhlinə xitab" adı ilə tanınan qəzəlidir:

Əya gürühi-sitəmgər, əhaliyi-Təbriz,
Vəfa yerinə cəfa sizdə bu nə adətdir?

Nə elmə talib olan var, nə mə`nidən agah,
Görüm ilahi, dağılsın, necə vilayətdir?!

Nə rahü rəsmi-nəsara, nə şiveyi-İslam,
Nə bütbərəst süluki, bular nə millətdir?!

Vüfuri vardır üç firqənin bu kişvərdə,
Axund ilə xərü xan bihədü nəhayətdir.

Onun əmmaməsi rəngin, bunun yükü səngin,
Xüsusən ol birinin cübbəsi qiyamətdir.

---

[82] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. I cild, Bakı, 1978, səh. 526.

Xəri çıxart aradan, bunlara şəbahəti yox,
O binəvanın işi rənc ilə riyazətdir.

Axund ilə xana hər tə`nə eyləsən yaraşır,
Bu müftəxorların əndişəsi şərarətdir.

Kimin ki, xülqü müzəyyəndir, istəməz zivər,
Kişi özün bəzəmək cəhldən əlamətdir.

Yetişdi iş o yerə ki, hər kəsin saqqalı
Hənalı olsa, uzun, hörməti ziyadətdir.

Ha böylə olsa parak, tazı tuladan yegdir,
Sürü içində siyiz sahibi-kəramətdir.

F.Köçərli qəzəlin hələ də aktuallığını saxlamasını göstərmək üçün onun məzmununu Zeynəlabdin Marağayinin (1838-1910) "İbrahim bəyin səyahətnaməsi" romanının mövzusu ilə müqayisə edirdi: "Bu şeirləri mərhum Abbasqulu ağa həştad sənə bundan irəli yazmışdır. Əgər indi "İbrahim bəyin səyahətnaməsi"nə diqqət yetirilsə, bu müddəti-mütəmadiyyənin ərzində Təbriz əhalisinin əhvali-ictimaiyyəsi, övzai-məişəti və əxlaqi-rəziləsi sabiqi qərar üzrə davam etməkdədir. Bu uzun müddətlərdə cümlə millətlər ayılıb tərəqqi etdikdə müsəlmanlar yatmaqdan usanmadılar; yatdılar və belə fəna hala düşdülər, məğlub və məyus oldular..."[83]

Abbasqulu ağa Bakıxanov mənzum məktubunda İran kəsafətinin əksinə olaraq Gürcüstanın ürəkaçan mühitinin, insanın azad nəfəs aldığı mənzərənin təsvirini verir, lakin burada da öz fəlsəfəsindən bir addım geri qoymurdu:

---

[83] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. I cild, Bakı, 1978, səh. 299.

Əbr içrə günəş manənd
Pərtov salır afaqə
Rüxsarəsi hər şuxun
Giysulər arsında.

Yüz işvəvü mehr ilə
Aşiqlərə meyl etmək
Bu şəhrdə adətdir
Mehrulər arasında.

Bunları görüb, Qüdsi,
Hər kimsə ki aqildir,
Qılmaz özünü rüsva
Bədgulər arasında.

Abbasqulu ağa Bakıxanov dövrünün barmaqla sayıla biləcək qədər nadir şəxsiyyətlərindən biri olduğu üçün söylədiyi şeirlərin, incə zövqlü kəlamlarının auditoriyasını görə bilmədiyindən daim bu tənhalığa qarşı mübarizə aparmağı qarşısına müqəddəs bir vəzifə kimi qoymuşdur. Yazdığı elmi və didaktik ədəbi əsərlərin müqəddiməsində dönə-dönə öz məqsədini açıqlamışdır:

“”Təhzibi-əxlaq” əsərindən:

“...əgər yenə bu vasitə ilə bir azacıq mənfəət hasil olub, onun bəzi mətləbləri kamal əhlinə layiqincə, başqalarına müəyyən dərəcədə təsir edərsə, deməli mənim səyim hədər getməmiş olacaqdır”;

“Nəsihətlər”dən:

“...hicrətdən 1252-ci il keçən bir zamanda (Miladi 1836) “Nəsayeh” adlı aydın və sadə analaşılan müxtəsər bir kitab yazdım. Allahın köməyinə ümid edirəm ki, bu əsər uşaqlara faydalı olub, onların tərbiyəsinə getdikcə daha artıq təsir etsin”.

Dünya biliklərindən faydalanmaq və ətrafını da məlumatlandırmaq məqsədilə Bakıxanov Amerikanın kəşfi və məskunlaşması haqqında fars dilində "Kəşfül-qəraib", ərəb dilində məntiqə dair "Eynül-mizan", fars dilində "Ümumi coğrafiya", astronomiyaya aid ərəb və fars dillərində "Əsrarül-mələkut" adlı elmi əsərlərini yazmışdır. "Əsrarül-mələkut" əsərinin maraqlı cəhətlərindən biri budur ki, Abbasqulu ağa astronomiyaya aid verdiyi məlumatları Quranın ayələri ilə təsdiq etmişdir. Bu barədə özü belə yazırdı:

"Astronomiyada iki bünövrə mövcuddur. Onlardan biri yunan Ptolomeyə məxsusdur, Yerin hərəkətsiz olması, Günəşin isə onun ətrafında dövr etməsi prinsipinə əsaslanır. Polyak Kopernikə məxsus ikinci mühakimə əksini təsdiq edir. Nəzəri elmlərdə ənənənin kor-koranə izlənməsinin yolverilməzliyi – xüsusilə hesab etsək ki, hər iki alim bizim cəmiyyətə yaddır, - ağlın həqiqətə yaxın hesab etdiyini və ilahi qanunların təsdiqlədiyini qəbul etmək zərurətini tələb edir...İkinci mühakimənin birincidən fərqli olaraq həndəsənin tutarlı dəlilləriylə təsdiq olunduğunu və hədislər və Quran ayələri ilə dəstəkləndiyini görərək mən hicrətin 1255-ci ilində ...coğrafiyadan "Göylər səltənətinin sirləri" adında qısa traktat tərtib etdim".

Öz millətinin, dövlətinin gələcək inkişafında tarixin öyrənilməsi zərurətindən çıxış edərək Bakıxanov "Gülüstani-İrəm" əsəri ilə milli tarixçiliyimizin əsasını da qoymuş oldu.

Azərbaycan elminin və ədəbiyyatının inkişafında möhkəm özüllü bir tramplin kimi çıxış edən Bakıxanov dühası ömrünün son çağlarında realizminin və həmçinin estetik baxışlarının ən mükəmməl əsəri olan "Kitabi-Əsgəriyyə" hekayəsini, özünün də qeyd etdiyi kimi, "misilsiz kitab"ını bədii nəsr tariximizə bəxş etmiş oldu.

## ABBASQULU AĞA BAKIXANOV

## KİTABİ-ƏSGƏRİYYƏ

Həmd olsun bir Allaha ki, qəlblər arasında ülfət yaratmış, onu camal parlaqlığı ilə işıqlandırmış və arzu edənlərin gözlərini ziyalandırmışdır. Böyük olan Allah deyir: "Nəfsin istəklərinə məhəbbət, qadınlara və uşaqlara sevgi... insanların gözündə gözəl göstərilmişdir"[84]. Məxluqatın ən şərəflisi Məhəmmədə və onun haqq yolda olan məsum övladına ələvat və salam olsun.

Əmma sonra möhnət silsiləsinin əsiri və məhəbbət zindanının dustağı

Fərd

dərd həbsxanasına bağlanmış, qəm-qüssədən üzülmüş,
möhnət bağının bülbülü, pərişan hallı Qüdsi

bu incə üslubla ağıl sahibləri dəstəsinə gizli məqsədlərini bəyan etmiş və bəsirət sahiblərinin ürəklərinin lövhələrinə bu ləzzətli üslubla nişanələr qələmini yürütdüyü hikmətin məzmunu budur ki, ruhlarla doldurulmuş ordu timsalında Onu tanımadan və "O şey ki onu kərəm sahibi edir" sübutunun ixtilafı ilə insan övladları yaradılış sirrinin xələtini geymədən məhəbbət zəncirinin əziyyətini çəkmişlər və bəşəriyyət vücudunun bağında və "insan həqiqətən də çox cahildir"[85] misalınca sıxıntı pöhrələrini əkmişlər. Surət aləmində bəşər təbiətindən lazım olan tələb budur ki, hər kimsə gərək bir növ məqsəd ilə könül gözünü pardaxlasın, şərəfli ömrünü puç və faydasız keçirməsin, hadisələr

---

[84] Qurani-Kərim. Ali İmran - 14

[85] "...Qna insan yükləndi. Həqiqətən, o, (insan) çox zalım və cahildir."

məclisində öyrənmək tələbi olan ağıl sahiblərinə qəflət camından cəhl badəsini içirməsin.

Hər ürəkdə ki yoxdur eşq nişanəsi
Qəm zinəti, eşq əfsanəsi,
Əlbəttə, deyil kamala qabil,
Ömrü keçər, amma nə nəticəsi?
Bu tələbdən bəhrəsiz qalar-
Səfa ləzzətinin əldə olunmağından.
Ey ürək, əgər xəyal zövqünü tutsan,
Dərk edərsən vüsal zövqünü.
Eşq ilə cahanda ehtiyacsız ol,
Amma davranışında dürüst ol.
O yolla ki, qılıbdır Əsgər,
Sevgilinin çöhrəsini arzulayır,
Taleyi cəfa göstərsə əgər,
Zindan kimi möhkəmdir vəfada.
Və əgər başına müsibət əli çalsa,
Çəkic kimi çarx çəkməz o qəmi.
Ah ilə ağız yolu bağlanar,
Müsibətlə dolu olan kora bənzəyər.

Yuxarıda adı çəkilmiş olan canı yanan sadiq aşiq və təngə gətirilmiş olan halı pərişan biçarə aşiqin halının qısaca xülasəsi və ayrılıq sıxıntısında rəftarının izahı oldur ki, Quba şəhərində Ahəngərzadə Əsgər adlı təzə yetişmiş cavan könül aldadan şirin xasiyyətli olub ki, söhbət gözəlliyinin bəyanında zahiri cəhətdən camalının gözəlliyində bənzəri yox idi.

Bir qara gözlüdür qəlbin bəlası,
Bir qaməti sərv, çöhrəsi nar çiçəyi,
Zülf və kəkili bir əyri papaqdır ki,
Boynuna zünnar kimi salıbdır.

Hər an qıyaraq baxanda gözü
Qiyamət təsiri bağışlayar.
Bülbül kimi səsi ürək çəkən ahənglidir,
Xoş ləhcə, gözəllər içində başçıdır.
O qönçə dodaqda cəm olubdur
Səda və üz gözəlliyinin təsiri.
Zülmə xəti etirafnamə
Söhbəti məhəbbət fənninə inkardır.

Əlqissə, ol canı yanan cəvan həmişə minbərlər rəisləri, böyüklər yığılan yerdə daha kiçik mərsiyəxan bəlkə kəndisinin işlərinin aqibətini yad edib nalə və fəryadla həmyoldaş olurdu. Və bu fəndə dövrün yeganəsi kimi ustad olan növhəxanların başçısından təlim alırdı və gah-gah əzəmətli hərəmsarayına məhrəmiyyət yolu ilə gedərdi. İttifaqən ol şəxsin ismət sədəfində şaha layiq bir ləli və iffət bağında bir laleyi-novxiz gülüzarı var idi ki, buruq-buruq saçları başını itirmiş aşiqlərin can quşunu ovlamaq üçün tələnin ipi kimi qat-qat, buruq-buruq, can alan xalı ol dam[86] içrə danə idi. Bu, qara baxışlı üsyankar gözün kipriklər xəncərini əldə tutub zalım işvəkarlıqla pusquda duran bəhanə idi.

Bir dünya gözəli huri yerişli,
Gözəl bəxtin günəşi və sevinci.
Ay kimi şirin hərəkətli sevgili,
Bədəni günəş kimi ağ sənəmdir
Ki, ondan qaynaqlanır nazın əsası.
Vah nə qamət, nə qiyamət, nə hündürlük!
İstiqamətdə "A" hərfi kimi mütənasibdir.
Bəlkə, qurtuluş sahiblərinə səbəbdir.
Vah, nə zülf, nə qara saçlar,
Ənbər saçan sünbüldür!
Əhsən, əyri qaşı hilal şəklində,
Al yanaqlarına gözəllik verir.

[86] Tələ

Vah, nə qaş! – Naz satanların dəstəbaşı,
Şübhəsiz, dua mehrabının küncüdür.
Vah, nə göz, bəlkə vəhşi ceyrandır,
Oynaq baxışlı vəhşiyə bənzəyir.
Kirpiklər hər biri bir iti xəncər,
Aşiqlərin qətli üçün susamışdır.
Sifəti o qədər bəzək tutubdur ki,
Bəşər gözəlliyinin işi deyil.

Əlqissə, ol iki atəş parçası bir-birə yetmək ilə məhəbbət atəşi ilə alovlanıb ürək və din xırmanını yandırdı.

O iki ayrılıq fəğanının əsiri,
Bir camdan sərxoş və xumar oldular.
Ağıl eşq ilə peyvənd tutub,
Bəla zəncirində bənd oldular.
Ağlın rabitəsinə əziyyət düşdü,
Can və ürəyə iztirab düşdü.

Gün-gündən ülfətin əsəri, məhəbbətin cazibəsi artıq olub arzunun əlaməti bir məqama yetdi ki, zövqi-aləmdə guya iki cismdə bir ruh oldu. Bu əsnada məlum olan müəllim hadisələr aləmindən əlaqələr bağını qırıb bəzəkli hurilərlə qucaqlaşdı və pak olan şərab piyaləsi [87] ilə nəşələndi (rəhmətüllahiəleyh[88]) və tanınmayan ev adamlarını, xüsusən Hüseyn və Abbasın və miras qalan mal-mülkündən əmmamə, kürk və əbasın, cübbə, daraq, misvak və ridasın[89], küləcə[90], şali-kəmərbənd[91] və qəbasın ol cəvanə həvalə edib yerində canişin etdi. Ol dəxi iftixarla hasil olan nəticədən sevincdən ürəyi açılaraq vüsal məkanına məhrəm olub zövq ilə ruzigarın keçirirdi.

Xoş halına o qüssəli aşiqin ki, şadlıq zövqü ilə
Gül üzlü sevgilisi lütf üzümdən mehriban olmuş.

---

[87] "Şərabən-təhura" Qurani-Kərimdə ayədən bir parçadır ("İnsan" – 21)
[88] Allah rəhmət eləsin
[89] dərvişlərin çiyinlərinə saldıqları yun qumaş
[90] yarımxəz üst geyimi
[91] parçadan olan belbağı

Məşuqu deyibdir ki, zülm və cəfa yolunu tərk eləyim,
Bir an rəhm eləyib ki, yazıqdır, bağrı qan olmuş.

Ta ki, zaman keçdikcə eyb axtaran dəstə və tənə edən tayfa, yəni könül qıran zülmkar düşmən bu hala vaqif olub sataşqan dillərini açdılar. Çün dəmirçi çəməninin qönçəsi ürəyi qana dönmüş aşiq çarəsiz Əsgər gördü ki, surəti-haldan əhali xəbərdar olub vüsal vaxtına imkanı qeyri-mümkün oldu və bir daha bəhanəsiz ol yerə getmək çətindir, dəmbədəm ah və nalələr çəkib deyirdi:

Ah ki, fələyin dönməsində ixtiyarım qalmadı,
Alçaqları bəsləyən aləm içində etibarım qalmadı.
Ruzigarım xoş keçirdi yarımla görüşməklə,
Ayrılıq həngamıdır, ol ruzigarım qalmadı.

Bir gün düşməndən gizli özünü ol şuxi-gülgunüzarə[92] yetirib dedi:

- Ey mehriban yarım! Ey canımın və ürəyimin dincliyi! Vey nazikbədən! Ey şəkər dodaq, şirinsözlüm! Şə`bədəbaz ruzigar, hiyləgər zəmanə fitnələr başlayıb vüsal səadətimizə ayrılıq möhnətini yetirmək istər. Nə çarə edim?

Dövrani-fələk nədir ki, bilmən,
Bivəch bizimlə oldu düşmən.
Ayrılıq üçün ah kim dəmadəm,
Qəm vəsilələri hazırlanır.

Ol şəkər dodaq, şirindil bu sözləri eşidib yaxasını cırıb üzünü atasının qəbrinə tutub şivən ilə səsləndi:

- Ya əkəllülhəlavət[93]! Ey atacan! Bir baş qəbirdən götür! Biz pərişanruzigar[94], tirəbəxtlərə[95] nəzər qıl! Bivəfa ərdəbillilər əlində necə ağlar və sərgərdan[96] qalmışıq!

[92] Al yanaqlı işvəli
[93] əkl – yemə, həlavət – şirniyyat; ağzı şirin olan mənasına gəlir.
[94] qəmli günlü
[95] bədbəxt, qaragün
[96] avara, sərsəri

Ürəyi qana dönmüş qəribiz, bizə bir yar tapılmaz,
Təsəlli verən tapılmaz.
Bir həmdəm və sirdaş və havadar tapılmaz,
Tərəfdar tapılmaz.
Düşmənlər edər tə`nə, dutar cəfa yolunu,
Bu gizli dərddir,
Yoxdur bizə bir rəhm qılan sahibi-namus,
Yüz ah, yüz əfsus!
Bu şəhrdə bir mö`min və dindar tapılmaz,
Əgər var, tapılmaz.
Ürək qana dönüb düşmən tənəsi qəmindən,
Xəlqin sitəmindən,
Qəmin şərhi üçün izhar fürsəti tapılmaz,
Ziyarətçi tapılmaz.

Ah, bunları bu hal ilə görüb və müsibət dəstini başa vurub[97] kim gəldi?

Beyt
Hüseyn! Hansı Hüseyn! Nəslin şərəfi,
Desəm dürüstünü, əhli-zəmanə naxələfi,
dedi:

- Bacıcan! Nə hadisənin əmri bu qəm-qüssəyə bais olubdur?

Dedi:

- Ah! Qardaş, kaş sənin kimi naxələf ölə idi, bu günləri görməyə idi.

Nə tab edim belə ədalətsizliyə, ya əxül-idbar[98],

---

[97] Ifadə iki mənada anlaşıla bilər: 1) müsibət əlini başına döyüb; 2) müsibət dəstəsini tamamlayıb.

Alıb qərarımı əyri dolanan taleyin dövrü.
Eşq avazı ilə ney tək dolub quru cismim,
Zaman-zaman çəkərəm bəs ki, od püskürən ah.

Qərəz, onlar ağlayıb nalə edirdilər. Əsgəri-biçarə gəlib qolların məşuqəsinin boynuna salıb və üzündən öpüb dedi:

- Ey canımın dincliyi! Fikr elə ki, atandan qalan əmmaməni başıma qoyub, əbasın çiynimə salub və Abbasın qucağıma alıb bir nifrin elərəm ki, düşmənlərimizdən biri də yer üzündə qalmaz.

Çün eşq odu əgər dutuşa canı yandırar,
Bir şö`lədir ki, cümleyi-dünyanı yandırar.
Məzlum aşiqin əgər ahı yüksəlsə,
Yeddinci göydə xərməni-Keyvanı[99] yandırar.

Xülasə, ol məzlumə dedi:

- Ey aşiqi-mehribanım! Bu sözlər fayda verməz. Bir fikir elə ki, sən bu yerə gəlmək üçün əlində bəhanə olsun və xalq bəd güman etməsin.

Dedi:

- Ey yari-mehribanım! On şahi pul sənə verim, amma məni rədd etmə, hər vaxt gəlib ol məbləği geri tələb eyləsəm, bir bəhanə ilə təxir et. Bəlkə bu vəsilə ilə bir-birimizi görmək müyəssər ola.

Cümləsi bu dürüst rəyi qəbul edib bir müddət dəxi ovqat keçirdilər.

---

[98] Omonimdir, üç mənada işlənir: 1) bəxtsizlik, talesizlik; 2) çəkilmə, geri çəkilmə; 3) çirkin, pinti, eybəcər. Yeri gəlmişkən qeyd edək ki, Bakıxanov öz hekayəsindəı omonimlərdən və çoxmənalı sözlərdən istifadə etməkə əsərinin simvolikasını gücləndirmişdir. Buna görə də belə sözlərin işlənməsini bir təsadüf kimi qəbul etməyərək üslub məsələlərinin öyrənilməsində nəzərə almalıyıq.

[99] Zühıl planetinin xərməni

Aşiqdə gərək fünuni-hiylə[100],
Ta eyləyə vəsl üçün vəsilə.

Qəfildən bir qeybətcil sözgəzdirən bu surəti-macəranı əla macəra varıb ol məhəllə rəisinə məlum etdi. Ol rəis dəxi müvəkkillər təyin etdi ki, hər yerdə ol ürəyi qana dönmüş aşiqi görsələr, tutub işgənceyi-siyasətə yetirsinlər. Çarəsiz Əsgərdən nəqldir ki:

- Çün çarə yolları hər tərəfdən bağlandı və rəis ilə saziş etməkdən başqa çarə görmədim və dedim:

Zülmü gör kim, ayrılıqdan canə yetdim aqibət,
Çarəsiz qaldım, varıb düşmənə könül bağladım.

Axirül-əmr bir gün əlimə bir parə nan[101] alıb üstündə rövğəni-kərə tışrə çıxdım. Adı çəkilən rəis mənə düçar olduqda ona hədiyyə edib dedim:

- Əgər nemət haqqını xatirdən çıxarsan, mənə təcavüz etsən, bu çörək gözlərini tutsun və nemətə qarşə etdiyin nankorluğun səmumu[102] ömür bağını xəzan etsin.

Hüznlü olan mənə gəl Allah rizası zülm eləmə,
Ki, aşiq ahı tutar zalimin yaxasını.

Dedi:

- Ey aşiqi-miskin! Bundan sonra könlünü rahat eləyib vüsal məclisinə məhrəm ol, kimsədə sənə təcavüz cürəti yoxdur.

---

[100] Hiylə fənni
[101] Çörək
[102] Səhralarda əsən çox şiddətli, isti və quru külək

Çəkmə qəm, ey ürəyiincik aşiq, mən yaram sənə,
Özgələr cövr eylədikdə mən həvadarəm sənə.

Əlqissə, bu mərhələdən dəxi sıyrılıb şadlıq məclisinin həmsöhbəti kimi kef məclisinə məşğul ikən:

Ol xəstəcigər bəlayə düşdü,
Bir qüssəli macərayə düşdü,
Çərx eylədi dövri-namüvafiq,
Hicran sitəmi arayə düşdü.
Aləmdə həmişə qəm qürrəsi
Aşiqlər günüqərayə düşdü.

Əyri dolanan dövranın işləri və yaman adamlar dəstəsinin əziyyəti, könül qıran düşmənin tənəsi və günün hadisələrinin sədəmələrindən canı yanan aşiq ilə məşuqeyi-mehriban arasında ayrılıq vaqe olub biri avareyi-diyar, biri vətənində qərib biqəmküsar[103] oldu.

Necə tab etsin aşiq könül canandan cüda?
Başsız və nizamsız qalır hər mülk sultandan cüda.

Aşiqi-biçarənin cismində can canan idi,
Necə şivən qılmasın kim, cism olur candan cüda[104]?

Xülasə, neçə cür nalə və şivən ilə bir-birindən vida edib məşuqə səfər qıldı. Və aşiqi-məhcur qan yağdıran göz yaşları ilə bikəs qaldı. Guya dəfələrlə bu şeiri oxuyub ağlardı:
Sənsiz xəstə ürək zar olubdur,
Dostsuz və yoldaşsız olubdur.

[103] yoldaşsız
[104] ayrı

Qanlı göz yaşı tutubdu sarı rəngim,
Bu gülşən üçün bahar olubdur.
Qanlı cigərim sanki lalə kimi,
Bürüşüb və dağılıbdır.
Hicran sitəmi alıb qərarim,
Gün işığı gözümdə qaralıbdır.
Hicrində düşüb bəlayə Əsgər,
Həyatı dağılıbdır.

Ol qəmli məzluma dəxi gündüzlər qərarsız sel kimi axan göz yaşlarını yollara sübut edərdi, gecələr yataq otağının şəmini ah alovu ilə yandırardı. Göz yaşına və ah ilə boğularaq gəzirdi, ürək qəmli, göz nəmli, hər mənzilə kim qədəm qoyardı, bu növ` ilə nəğmə deməyə başlayardı:

Nəşə və arzunun səbəbi, sənsiz,
Qanlı cigərəm həmişə sənsiz.
Hər dəm mənə ayrılıq qasidin,
Qəmdən gətirir xəbər sənsiz.
Eyb etmə sözüm dolaşıq olsa,
Yox təb`idə bir nizam sənsiz.
Çəmənin seyri, işrətin nəticəsi
Kədərim olur tamam sənsiz.
Dünyada şadlığın hasili
Olmazmı mənə haram sənsiz?!
Mən bikəsə möhnət küncü olmuş
Hicran gecəsi məqam sənsiz.

Zaman-zaman vüsal əyyamını yad etməklə güli-seyrabının yaxasını yırtardı və ləhzə-ləhzə[105] görüş zövqünün təmənnasını eyləməkdən lalə kimi həsrət dağını sızıldayan sinəsinə çəkərdi və bu şeiri oxurdu:

---

[105] anbaan

Bülbül necə gülzar ətəyindən əlin üzməz,
Şivən xəstə könül ətəyindən əlin üzməz.
Qanilə boyar yanaqlarımı gül-gül,
Könül zalım gözlərin ətəyindən əlin üzməz.
Ürək bəla dərdi çəkmək ilə qəmdən usanmaz,
Ol cəfakar gözəlin ətəyindən əlin üzməz.
Göz pərdəsi qanlı su ilə rəngindir, əmma
Nəzzareyi-didar[106] ətəyindən əlin üzməz.
Müxtəlif müsibətlərin qəmi və bəla qisimləri
Qüssəli aşiqlərin ətəyindən əlin üzməz.

Bilmərrə səbr ətəyindən əlin üzüb ayrılığa tab etmədi və görüşmək dövlətinin arzusu ilə bir müddət sonra yenə müraciət edib, cananın yaşadığı yerə qonşu olmaq istədi. Şəhərin yaxınlığına yetdikdə tərk edilmiş aşiq qəlbi yandıran ah çəkməkdən gül üzü xəzan yarpaqları tək saralmışdı və müsibət yükünün ağırlığından yaraşıqlı qaməti bükülmüşdü.

Gül üzünün təravəti xəzanə dönüb,
Qəddi əyilib, qaməti kəmanə dönüb.
Göz yaşı axır dağ seli kimi,
Cigər od tutub qəmdə, bağrı qanə dönüb.

Könülaçan məşuqənin gəlmə xəbərini eşitdikdə xəstəlik yatağından durub əlinə bir əsa alıb zəif halda kəmali-qüvvət ilə şəhərdən tışrə çıxdı, guya bu sözləri deyirdi:

Söylə, ey həmdəm, kərəm qıl yarımın halından mənə,
Həqq rizası, bir xəbər ver gülüzlümdən mənə.
Yolumu işıqlı eylə, gəl, ey atəşin ah,
Qaranlıq olubdur işıqlı gün intizarımdan mənə.

[106] Camalın seyri

Qəfil gördü kim, sevgililər başçısı Leylinin karivanı yetişdi. Nəhayət, şövqlə yügürüb özün onun ayağına salıb bu növ` ədayi-şükr[107] etdi:

Allaha şükr olsun ki, tale arzuma çatdırdı,
Ədalətsiz cəfa ilə ayrılıq rahatlığımı almışdı.

Pəs ol kim, cigəri qana dönmüş biçarələrin təbrik sözləri ilə mübarəkbadlıq sədası zaman və məkandan büllənd[108]oldu, məşuqə həsrət nəzəri ilə baxıb dedi:

-Ey ürəyi yanan çarəsiz aşiq, ey dəmirçi çəməninin qönçəsi! Bu nə kədərli halətdir ki, müşahidə qılıram? Aya, dövranın işləri, zamanın əziyyət verən oğulları sənə nə zülmlər etmiş ki, surəti-halın bu məqamə yetmiş?

Əsgəri-biçarə bu sözləri eşidib sel kimi göz yaşını çeşməyə bənzər gözündən axıdıb dedi:

- Ey könülaçan yarım, ey işvəbaz yarım!
Ey rövşəneyi-düçeşmi-xunbar,
Arami-dili-həzini-bimar!
Kami-dili arizuyi-didə,
Asayişi-cani-möhnətasar.

Kim mənə əziyyət etməyə qadir olur? Surəti-əhvalıma təcavüz qılır kim, bu növ ürəyi incik naxoş etsin? Və ya gərdişi-dövrandan, zaman hadisələri aləmindən nə qorxum var ki, işimin aqibəti bu məqama yetsin?

Mənəm dəmirçi bağının yeni gülü,
Mənəm valideynin əziz Əsgəri.
Mənəm kim, atam çəkucundan səda
Alır neylufər çərxinin günbədi
Onun kürəsindən yüksəlsə əgər,
Fələkdə qığılcım yandırar ulduzu.
Verir xəlqi suri-Srafiltək

---

[107] Minnətdarlıq tərzi
[108] Yüksəlmək

Yoxluğa onun nəfəsi bir anda[109].
Əgər Gavətək dava bayrağı qaldırsa,
İtaət qılar aləmin əksəri.
Onun sümtəraşi o qədər itidir,
Edib xəcalətli qılınc və xəncəri.
Əgər görsə Rüstəm onun zərbini[110],
Şücaətdə eylər vücudun bəri.

Amma sənin ayrılıq dağından bu cür pərişan olmuşam. Və gül sifətinin ətrindən qızılgül qönçəsitək bağrı qan olmuşam.

Sənin fəraqın alıbdır qərar və taqətimi,
Qəhər səmumu ilə gül yarpağıtək xəzan olmuşam.
Edəndə yad o gün yanağını bülbül kimi,
Həmişə nalə və fəğan dilimin əzbəridir.

Məşuqəsi dedi:

- Ey cani-şirin! Mən dəxi səndən ayrı çəkdiyim bəlaları şərh etsəm, söhbət uzun çəkər kim, izhar etməmək münasibdir. Hala bir tədbir et kim, vüsala səbəb olsun.

Bir yan fələk cəfası mənimçün qəm artırır,
Bir yan zəmanə gərdişi min matəm artırır,
Bir yan həsud tə`nəsi bağrımı qan edər,
Bir yan qərib cövri hər dəm artırır.
Eşqin bəlası yaralı sinəyə ah kim,
Hər ləhzə arzunu dərmansız artırır.
Bunlar qamusu yüngüldür, asan tədarüki,
Hicran hüznlü ürəyə çoxlu qəm artırır.

[109] Firdovsinin “Şahnamə” əsərinin surətlərindən dəmirçi Gavəyə işarədir. O, öz döşlüyünü bayraq edib qaniçən Zöhhakı taxtdan salmışdı.
[110] “Şahnamə”də yenilməz pəhləvan Rüstəm Zala işarədir. Şair demək istəyir ki, Rüstəm onun zərbəsindən qorxub çəkilərdi.

Bir çarə fikrin eylə vüsal məcalı üçün,
Ayrılıq dövrü ən böyük arzunu artırır.

Və atan tərifini bəyan etdiyindən mehriban anam dəxi ona aşiq olmuşdur. Nə ola əgər varub şəriət ehkamında diqqətlə araşdırasan, əgər caiz və mübah [111] isə, məni sən aldıqdan sonra hörmətli validəmi də ki böyük mövqe tutmuş validinə ərə verməklə şad qılasan ki, əhli-beyt arasında təfriqə [112] düşməsin. Və Abbas, Hüseyn bir-birindən ayrılmasın və başsız qalmış mirasın cəminə malik olub alimiqdar validim məqamında onu əvəz edən ada sahib olasan.

Bir daha qismət bizə ayrılıq qəmi olmasın,
Xatiri-cəm`iyyətim qəmdən pərişan olmasın.
Ta ki təxti-gülbün[113] üzrə gül qoyar başına tac,
Könlümün şəhrinə səndən özgə sultan olmasın.

Pəs, Əsgəri-biçarə dəxi bu məsləhətdən xeyir ümidin mülahizə edib bir fəzilət sahibi olan alimə və zəmanənin yeganəsinin hüzurinə varıb mənanı açma üsuluyla soruşdu ki:

- Bir kimsə əgər bir həddi-büluğa çatmamış qızı nikah yaşına çatdırsa, qəfildən nikahlı atasının qızın anasından izdivac mənfəəti alması caizmidir?

Çün eşq məzhəbində bu surət müşkül məqam idi, ol fazil məsələni eşq təriqətinin başçısının fitvasına həvalə etdi. Bir gecə kim, dünyanı bəzəyən gəlin mehri-ənvari-zülməti-şamdan müşk zülflərini sifətinə töküb hideyi-rübdə[114] aram buldu və Qəmər[115] qonaqlıq məclisi tərtib edib ki, gecə

---

[111] şəriətcə haram və ya məkruh olmayan şey kimi izn verilərsə
[112] ikitirəlik
[113] Gül ağacı
[114] Hideyi-rüb: rüb - dörddə bir; hidə -gecənin üçdə biridir
[115] ay

qaranlığını günün qeyrəti və Leylinin çöhrəsi kimi bəzəkli edib fələklər səyyarında qızıl-gümüşdən təbəqlər doldurub dağıtmaq üçün hazır elədi.

Mehr[116] oldu büsati-çərxdən dur,
Mah aldı əlinə şəm`i-kafur.
Bir türfə şəbü xücəstəfərcam,
Onun kimi görməmişdi əyyam.
Novruz günündən ol füzun qədr[117],
İzzətlə misali-leylətül-Qədr[118].

Cümlə yaradılmışlar rahat yuxuda olub çarəsiz Əsgər mat-məəttəl başını qəm yastığına qoyub gah ürək incidən düşmənin zülmünü yad edib nalə və əfğan çəkərdi, gah gül bağçasından ayrılıq sıxıntısında göz yaşını sel kimi yanağına tökərdi və deyərdi:

Qəm canimə qəsd eylər əlim yarə yetişməz,
Mətlubə nədəndir biçarə ürək yetişməz.

Hicran çəkərəm hali-pərişan, günüqarə,
Ümmid əlim ol dolandırıcı zülflərə yetişməz.

Başlar aşiq könül fəğan yardən ayrı,
Bir bülbülə bənzər ki, gülzarə yetişməz.

Hərçənd ki var qönçədə yüz növ` nəzakət,
Bihudədir ol lə`li-gövhərbarə yetişməz.

Guya tutalım hüsndə məşhuri-cahandır,
Rüxsari-gül, amma güli-rüxsarə yetişməz.

---

[116] Günəş
[117] O qədər uzun
[118] Qədr gecəsi misalınca

Yansın bu necə tale varundur ki, Əsgər,
Ömrün tükədir hicrdə, sevgiliyə yetişməz.

Və gah əyri dolanan fələkdən şikayətlər edib bu avaz ilə tərənnüm edərdi:

Görəyim dövri-fələk mən kimi qəmli olsun,
Qoymadı vəfa əhli qüssədən azad olsun.
Dağılıb bir-birə dəysin bu rəvaqi-niyli,
Könlümün şəhri kimi qübbəsi bərbad olsun.

Və gah könül açan, can alan sevgilinin xəyalına şahid kimi xitab edərək söylərdi:

Yox səndə, qəmi-eşqdən, ey dust, nişanə,
Mən qəmzədənin surəti-halın nə bilirsən?
Sən rahat yataqda yuxulayıb,
Aşiqlərin sıxıntı qəmini nə bilirsən?

Xülasə, ol qədər nalə və şivən qıldı ki, zahiri görən gözləri bağlanıb bəsirət gözünü açdı. Röya aləmində gördü ki, məğfuri-mərhum, müəllimi-məlum qəbrindən qiyam edib məscidə gəldi. Mənbər üzərə çıxıb moizələr qılırkən dedi:

- Handadır mənim canişinim?

Pəs, cigəri qan ağlayan Əsgər ləbbeykguyan [119] səmimiyyət ehramı bağlayıb səfa[120] əldə etmək üçün səy edib

---

[119] "Əmr sizindir!" deyən: Zəvvarlar Hərəmi Şərif hüdudlarına yaxınlaşanda "Ləbbeyk" sədaları yüksəlir. " Zülqədə ayının 25-ci cümə ertəsi günü həzrəti Peyğəmbər yuyunduqdan sonra ehrama girmiş, günorta namazını qıldıqdan sonra bu böyük qafilə ilə Mədinədən hərəkət edərək Məkkə yolunu tutmuşdu. Bütün zövcələrini də özü ilə bərabər həccə aparırdı. Hərəmi Şərif hüdudna gəldikləri zaman Ləbbeyk sədaları yüksəlməyə başladı. Hər tərəfdən yollara tökülən hacılar "Ləbbeyk" dedikcə hər tərəfdə səs yüksəlir, dağlar-daşlar bu səda ilə cingildəyirdi." Əli Hikmət Bərgi, Osman Kəskioğlu. Xatəmül-Ənbiya: Həzrəti Məhəmməd və həyatı. Ankara, 1993, səh. 550.

[120] Omonimdir, burada ikimənalılıq yaratmaq üçün işlədilmişdir: 1. saflıq xalislik, duruluq; 2. xatircəmlik, fikirsizlik, rahatlıq. "Saflıq" və "rahatlıq" mənaları arasında dilemma yaradılmışdır.

kəndisin məqsəd Kəbəsinə qurban vermək üçün məqamından durub hüzuruna getdikdə dedi:

- Ey gözümün işığı! Xoştale qızımı sənə nikahladım. Bundan sonra mənim malım və əyalım[121] sənə məxsusdur. Amma gərəkdir ki, mənim Abbasımı əziz tutasan, nəvazişlər edəsən.

Yetim olan kəsə, əlbəttə, qəmküsar olmaz,
Zəlili-aləm olur, izz və e`tibar olmaz.
Bəlalər içrə qalır dərbədər, anı keçməz,
Ki, bağrı qanə dönüb didə-əşkbar[122] olmaz.

Sübh çağı kim, tülu[123] edən sübhi-sadiq[124] bu zövq artıran məzmuna müvafiq kəraneyi-üfiqdən zahir olub aləmin zülmlərinə giriftar olanlara işıqlı günlərdən gözaydınlığı verdi. Çarəsiz Əsgər bu doğru yuxudan dostlara hekayət qıldı və cəlal sahibinin yardım edən lütfünü arzulamaqla uzun müddət gözləyərək bu rübaini dil əzbəri etdi:

Gərçi ah və ixtiyarsız nalə eylər könül,
Vəsflərin zikri ilə həsrəti dəf eylər könül,
Hicr əyyamində bəs kim, qüssə uzun əncam olur,
Saətin ay, hər günün bir il hesab eylər könül.

Ümidvaram ki, inşaallah-təala ən yaxın zamanda aralarında qovuşma vaqe olub, təbrik ədası ilə mübarəkbad edim və ol məzmunə yeni inşa qılım:

İlahi, bu duamı gerçəkləşdir,
Faydalı istəklərin hasilini nəsib et.

[121] Arvad-uşağım
[122] Göz yaşı axıdan göz
[123] doğan
[124] Ağaran dan yeri

****

Hədiyyə bağışlayana həmd olsun,
paklığın yaradlcısına şükr olsun...
Ki uca mərtəbə qazanan
müşk qələmimlə faydalandırmışdır.
Bir misilsiz kitab tərtib edib
dostlar üçün hədiyyə etmişəm.
Səadətin hökmü ilə
tamamlanmışdır: “Kitabi-Əsgəriyyə”.
Ola bilər ki, qurtuluşumun səbəbi
olsun bu mənəvi işlərim.

# KİTABİ – ƏSGƏRİYYƏ

Əlhəmdü lil-lahil-ləzi ələfə beynəl-qülubi və nəvvərəhu bi-şraqabil-cəmaliyyə üyunəl-müştaqin. Və qalə əzimə şə`nühu: "Züyyinə linnasi-hübbuş-şəhəvati minən-nisai vəl-bənini" vəssəlatü əla əşrəfil-müminat Mühəmmədin və alihi raşidin-əl-mə`sumin.

Əmma bə`d pabəsteyi-səlasili-möhnət və giriftari-zindani-məhəbbət

Fərd

Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,
Bülbüli-gülzari-möhnət Qüdsiyi-şuridəhal

bu rəsmi dilaviz ilə firqeyi-ülul əlbabə bəyani-mafilbal etmiş və əlvahi- zəmairi-ərbabül-bəsairə bu şiveyi-zövqəngiz ilə qələmi-ə`lam yürütmüş ki, çün məzmuni-hikmət məşhunil-ərvahi-cünudi məcənnədə təarifi-minha etmədən və "Ma təkərrümiha" ixtilafi-dəlalət ilə xəl`əti-xilqəti-işbah geymədən rəqabeyi-zənciri-məhəbbət çəkmişlər və riyazi-vücudi-bəşəriyyədə "... və həmələhul-insanü innəhu kanə zəlumən cəhulan" misdaqincə nihali-möhnət əkmişlər. Labüdd aləmi-surətdə iqtizayi-təbiəti-bəşəri oldur ki, hər kimsə gərək bir növ mənzur ilə cilabəxşi-dideyi-dil olub, ovqati-şərifi zaye və bihudə keçirməsin və bəzmi-həvadisdə cami-qəflətdən təb`i-talibi-huşyarə badeyi-cəhl içirməsin.

Hər dildə ki yox nişaneyi-eşq,
Arayişi-qəm, fəsaneyi-eşq,
Əlbəttə, deyil kəmalə qabil,
Ovqati keçər, vəli nə hasil?
Bibəhrə qalar bu müddəadən,
Təhsili-ləzayizi-səfadən.
Ey dil, duta gər xəyal zövqün,

Ta dərk edəsən vüsal zövqün.
Eşq ilə cahanda biniyaz ol,
Əmma rəvişinlə pakbaz ol!
Ol vəchilə ki qılıbdır Əsgər,
Meyli-həvəsi-liqayi-dilbər.
Dəhr etsə əgər cəfa iradə,
Sindan kimi səxtdir vəfadə.
Vər başına çalsa dəsti-matəm,
Çakuc kimi çərx çəkməz ol qəm.
Ah ilə olur dəhən yolu bənd,
Ləbrizi-şərarə kurə manənd.

Məzkur olan aşiqi-sadiqi-suxtəcan və məztur olan dərdməndi-müstəməndi-hali-pərişanın təlxisi-bəyani-halı və izhari-süluki-möhnətü məlalı oldur ki, Quba şəhərində Ahəngərzadə Əsgər adlı bir cəvani-növrəsü şirin şəmaili-dilfirib olub ki, hüsnü bəyani-məqaldə və səbahəti-surətdə cəmalda ədimül-misal idi:

Bir çeşmi siyahi afəti-dil,
Bir qaməti sərv, çöhrə gülnar,
Bir kəc küləhi ki, züfü kakil,
Boynuna salub misali-zünnar.
Hər ləhzə qıya baxanda çeşmi
Asari-qiyamət eylər izhar.
Bülbül kimi sovtü ləhni dilkəş,
Xoş ləhcə, sənəmlər içrə sərdar,
O qönçə dəhəndə cəm` olubdur,
Tə`siri-sədavü hüsni-rüxsar.
Zülmə xəti e`tirafnamə,
Goftarı fününi-mehrə inkar.

Əlqissə, ol cəvani-suxtəcan həmişə rüəsi-mənabirdə və məcməi-əkabirdəvü əsağirdə mərsiyəxan, bəlkə əvaqibi-ümurin yad edib həmqərini-naləvü əfqan olurdu. Və bu fənndə

ustad olan bir yeganeyi-ruzgardən ki, növhəxanlar sərxeyli idi, kəsbi-təəllüm edərdi və gah-gah hərəmsərayi-iclalına məhrəmiyyət yolu ilə gedərdi. İttifaqən ol şəxsin sədəfi-ismətdə bir gövhəri-şəhvari və gülşəni-iffətdə bir laleyi-növxiz gülüzarı var idi ki, zülfi-girehgiri sərgəştə aşiqlər mürği-ruyin seyd etmək üçün türreyi-dam tək xəmdərxəm, xali-cansitani ol dam içrə danə idi. Və çeşmi-kafər-nigahi-siyahi xəncəri-müjgan əldə dutub şiveyi-xunrizlikdə mürəssidi-bəhanə idi:

Bir dilarami-cəhan seyrəti-hur,
Afitabi-fələki-hüsnü sürur.
Dilbəri-məhvəşi-şirinhərəkat,
Büti-siminbədənü hurisüfat,
Qəddi bir sərvi-rəvan, mayeyi-naz,
Ki bülənd ondan olur payeyi-naz
Vəh nə qamət, nə qiyamət, nə füzun!
İstiqamətdə əlif tək mövzun.
Bəlkə sərrişteyi-ərbabi-nicat.
Vəh nə zülfü nə səvadi-giysu!
Sünbüli-pürşikəni ənbərbu.
Mərhəba əbrəyi-xəm şəkli-hilal,
Zibibəxşi-şəfəqi-arizi-al.
Vəh nə qaş! – sərxəti-məhbubeyi-naz,
Lacərəm guşeyi-mehrabi-niyaz.
Vəh nə göz! Bəlkə qəzali-vəhşi,
Nigəhi-şuxi, misali-vəhşi.
Müjələr hər biri bir xəncəri-tiz,
Qətli-üşşaq üçün olmuş xunriz.
Dutub ol qədr cəmali zivər,
Ki, deyil hövsələyi-hüsni-bəşər.

Əlqissə, ol iki atəşparə bir-birə yetmək ilə atəşi-məhəbbət nairəəfruz olub xərməni-dilü dini yandırdı.

Ol iki əsiri-zarü məhcur,
Bir camdən oldu məstü məxmur,

Eşq ilə tutub kəmal peyvənd,
Zənciri-bəladə oldular bənd.
Sərrişteyi-əqlə tab düşdü,
Canü dilə iztirab düşdü.

Gün-gündən asari-ülfətü cəzabati-məhəbbət ziyadə olub rəsmi-iştiyaq bir məqamə yetdi ki, zövqü aləmdə guya iki cismdə bir ruh oldu. Bu əsnada müəllimi-mövsuf aləmi-həvadisdən qə`ti-rəvabəti-əlayiq edib, həmağuşi-ərayisi-hura və nəş`əyabi-sağəri-şərabən təhura oldu (rəhmətullahi-əleyh) və əhli-beyti-naşünasın, xüsusən Hüseynü Abbasın və müxəlləfatdan əmmamə, pustin əbasın, cübbə, şanə, misvak və ridasın, küləcə, şali-kəmərbənd və qəbasın ol cəvanə vagüzar edib yerində canişin etdi. Ol dəxi kəmali-iftixarü nişatü nəhayət sürurü inbisat ilə məhrəmeyi-hərimi-visal olub zövqlə ruzgarın keçirirdi.

Xoşa ol aşiqi-dilxunə kim, zövqi-sürur ilə,
Nigari-gülüzarı lütf üzündən mehriban olmuş.
Deyib mə`şuqi kim tərk eyləyim cövrü cəfa rəsmin,
Edib bir dəm tərəhhüm kim, yazıqdır bağrı qan olmuş.

Ta ki, müruri-zaman ilə firqeyi-eybcu və taifeyi-tə`nəcu, yə`ni əğyari-dilazarü sitəmşüar bu hala vaqif olub zəbani-təərrüz açdılar. Çün növgüli-çəməni-ahəngər aşiqi-dilxun Əsgəri-müztər gördü ki, surəti-haldan xəlayiq müttəle olub məcali-visal imkanı məhal oldu minbə`d bəhanəsiz ol yerə getmək mütəəzzirdir, dəmbədəm ahü nalələr çəkib deyirdi:

Ah, kim dövri-fələkdə ixtiyarım qalmadı,
Aləmi -dunpərvər içrə e`tibarım qalmadı.
Ruzigarım xoş keçirdi dövləti-dildarilə,
Ayrılıq həngamıdır, ol ruzigarım qalmadı

Bir gün əğyardən məxfi özünü ol şuxi-gülgün üzarə yetirib dedi:

- Ey yari-mehriban! Ey arami-dilü can! Vey nazikbədən, gülpirəhən! Ey şəkərləb, şirinsüxən! Ruzigari-şə`bədəbaz zəmaneyi-hiyləsaz fitnələr ağaz edib dövləti-vüsalə möhnəti-fəraq yetirmək istər. Nə çarə edim?

Dövrani-fələk nədir ki, bilmən,
Bivəch bizimlə oldu düşmən.
Təfriq üçün ah kim dəmadəm,
Təmhid qılır vəsaili-qəm.

Ol şəkərləb, şirinzəban bu sözləri eşidib, çaki-giriban edib, üzünü atasının qəbrinə tutub şivən ilə səsləndi:

- Ya əkəllülhələvat! Ey atacan! Bir baş qəbirdən götür! Biz pərişanruzigar, tirəbəxtlərə nəzər qıl! Bivəfa ərdəbillilər əlində necə zar və sərgərdan qalmışıq!

Dilxun qəribiz, bizə bir yar tapılmaz,
Qəmxar tapılmaz.
Bir həmdəmü həmrazü həvadar tapılmaz.
Ənsar tapılmaz.
Düşmənlər edər tənə, dutar rəsmi-cəfasın,
Bu dərdi-nihani,
Yoxdur bizə bir rəhm qılan sahibi-namus,
Səd ah, səd əfsus!
Bu şəhridə bir mö`minü dindar tapılmaz,
Gər var, tapılmaz.
Dil qanə dönüb tə`neyi-əğyar qəmindən,
Xəlqin sitəmindən,
Şərhi-qəm üçün fürsəti-izhar tapılmaz,
Didar tapılmaz.

Ah, bunları bu hal ilə görüb və dəsti-müsibət başa vurub kim gəldi?

Beyt

Hüseyn! Hansı Hüseyn? Dudmanın şərəfi,
Desəm dürüstünü, əhli zəmanə naxələfi.

Dedi:

- Bacıcan! Nə əmri-hadis buənduhə bais olubdur?

Dedi:

- Ah! Qardaş, kaş sənin kimi naxələf ölə idi, bu günləri görməyə idi:

Nə tab edim belə bidadə ya əxül-idbar,
Alub qərarımı dövri-sipehri-gəcrəftar.
Nəvayi-eşq ilə ney tək dolub quru cismim,
Zaman-zaman çəkərəm bəs ki, ahi-ətəşbar.

Qərəz, onlar ağlayıb nalə edirdilər. Əsgəri-biçarə gəlib qolların mə`şuqəsinin boynuna salıb və üzündən öpüb dedi:

- Ey arami-canım! Fikr elə ki, atandan qalan əmmaməni başıma qoyub, əbasın çiynimə salub və abbasın qucağıma alıb bir nifrin elərəm ki, düşmənlərimizdən biri də yer üzərində qalmaz.

Çün eşq odu əgər dutuşa canı yandırar,
Bir şö`lədir ki, cümleyi-dünyanı yandırar.
Məzlum aşiqin  əgər ahi bülənd ola,
Yeddinci göydə xərməni-Keyvanı yandırar.

Xülasə, ol məzlumə dedi:

- Ey aşiqi mehribanım! On şahi pul sənə verim, əmma məni rədd etmə, hər vaxt gəlib ol məbləği mütalibə eyləsəm, bir bəhanə ilə tə`xir et. Bəlkə bu vəsilə ilə bir-birimizi görmək müyəssər ola.

Cümləsi bu rə`yi-dürüstü qəbul edib bir müddət dəxi ovqat keçirdilər.

Aşiqdə gərəkdir fünuni-hiylə,
Ta eyləyə vəsl üçün vəsilə.

Nagah bir ğəmmaz suxənçin bu surəti-macəranı əla macəra varıb ol məhəllə rəisinə mə`lum etdi. Ol rəis dəxi müvəkkillər tə`yin etdi ki, hər yerdə ol aşiqi-dilxuni görsələr, tutub işgənceyi-siyasətə yetirsinlər. Əsgəri-müztərdən nəqldir ki:

- Çün rahi-çarə hər tərəfdən məsdud oldu və rəis ilə saziş etməkdən başqa çarə görmədim və dedim:

Zülmü gör kim, ayrılıqda canə yetdim aqibət,
Çarəsiz qaldım varıb əğyarə könlüm bağladım.

Axirül-əmr bir gün əlimə bir parə nan alıb üstündə rövğəni-kərə tışrə çıxdım. Rəisi-məzkur mənə düçar olduqda təarif ilə ona verib dedim:

- Əgər həqqi-ne`məti fəramuş edib mənə təərrüz qılsan, bu nan gözlərini tutsun və səmumi-küfrani-ne`mət gülşəni-ömrünü xəzan etsin:

Məni-həzinə, gəl, Allah rizası cövr eləmə,
Ki, aşiq ahı dutar zalimin giribanın.

Dedi:

- Ey aşiqi-miskin! Bundan sonra fariqülbal olub bəzmi-vüsalə məhrəm ol, kimsədə cür`əti-təərrüz sənə yoxdur:

Çəkmə qəm, ey-aşiqi-dilxəstə mən yarəm sənə,
Özgələr cövr elədikdə mən həvadarəm sənə.

Əlqissə, bu te`daddan dəxi fariğ olub məşğuli-işrətü nədimi-məhfili-məsərrət ikən:

Ol xəstəcigər bəlayə düşdü,
Bir qüssəli macərayə düşdü.
Çərx eylədi dövri-namüvafiq,
Hicran sitəmi arayə düşdü.
Aləmdə həmişə qüreyi-qəm,
Üşşaq günü qərayə düşdü.

Gərdişi-dövrani-gəcrəftar və iyzai-firqeyi-əşrar, tə`ne-yi-dilşikəni-əğyar və sədəmati-həvadisi-ruzigardan aşiqi-suxtəcan ilə mə`şuqeyi-mehriban arasında müfariqət vaqe olub biri avareyi-diyar, biri vətənində qərib, biqəmküsar oldu.

Necə tab etsin dili-şuridə canandan cüda?
Bisərü saman qalır hər mülk sultandan cüda.

Aşiqi-biçarənin cismində can canan idi,
Necə şivən qılmasın kim, cism olur candan cüda?!

Xülasə, ənvai-naləvü şivən ilə bir-birindən vida edib məşuqə səfər qıldı. Və aşiqi-məhcur dideyi-xunbarilə bikəs qaldı. Guya mükərrər bu şe`ri oxuyub ağlardı:

Sənsiz dili-xəstə zar olubdur,
Bimunisü qəmgüsar olubdur.
Xunabə tutubdu rəngi-zərdim,
Bu gülşən üçün bəhar olubdur.
Xunin cigərim də sani-lalə,
Əfsürdəvü dağidar olubdur.
Hicran sitəmi alıb qərarim,
Gün nuri gözümə tar olubdur.
Hicrində düşüb bəlayə Əsgər,
Sərgəşteyi-ruzigar olubdur.

Ol məzlumeyi-ğəmnak dəxi gündüzlər seylabi-əşki-biqərarın dəlili-rah, gecələr şəbi-şəbistanın şö1leyi-ah edərdi. Qafileyi-əşkü ahilə həmsəfər, dil pürratəşü didə tər, hər mənzilə kim vürud edərdi, bu nö`vilə ağazi-sürud edərdi:

Ey mayeyi-eyşü kam, sənsiz,
Xunin cigərəm müdam sənsiz.
Hər dəm mənə qasidi-fəraqın
Qəmdən gətirir pəyam sənsiz.
Eyb etmə sözüm müşəvvəş olsa,
Yox təb`idə bir nizam sənsiz.
Seyri-çəmənü kəmali-işrət,
Ənduhim olur təmam sənsiz.
Dünyada hüsuli-şadimani,
Olmazmı mənə həram sənsiz?!
Mən bikəsə künci-möhnət olmuş,
Hicran gecəsi məqam sənsiz.

Zaman-zaman yadi-əyyami-vüsal etmək ilə güli-seyrabını giribançak edərdi və ləhzə-ləhzə təmənnayi-zövqi-mülaqat eyləməkdən laləsifət daği-həsrət sineyi-suzanə çəkərdi və bu şe`ri oxurdu:

Bülbül necə gülzar ətəyindən əlin üzməz,
Şivən dili-bimar ətəyindən əlin üzməz?!
Qanilə boyar səfheyi-rüxsarımı gül-gül,
Dil, dideyi-xunbar ətəyindən əlin üzməz.
Dil dərdü-bəla çəkmək ilə qəmdən usanmaz,
Ol şuxi-cəfakar ətəyindən əlin üzməz.
Göz pərdəsi xunabilə rəngindir, əmma
Nəzzareyi-didar ətəyindən əlin üzməz.
Əqsami-bəlavü qəmi-ənvai-müsibət,
Üşşaqi-cigərxar ətəyindən əlin üzməz.

Bilmərrə daməni-şəkib dəsti-iqtidarından gedib tabi-fəraq etmədi və arizuyi-dövləti-didar qılıb bir müddət sonra yenə müraciət edib, mücaviri-kuyi-canan olmaq istədi. Qürbi-şəhrə yetdikdə aşiqi-məhcur kim ahi-cansuz çəkməkdən gülbərgi-üzari övraqi-xəzan tək saralmışdı və bari-müsibət həmlindən qaməti-mövzunu xəm olmuşdu:

Təravəti-güli-rüxsarəsi xəzanə dönüb,  
Qəddi xəmidələnib, qaməti kəmanə dönüb.  
Sirişki-didə rəvan seyli-kuhsaran tək,  
Cigər şərarə tutub qəmdə, bağrı qanə dönüb.

Mə`şuqeyi-dilaranın xəbəri-vürudin istima` etdikdə bəstəri-mərizdən durub, əlinə bir əsa alıb, haləti-zə`fdə kəmali-qüvvət ilə şəhərdən tışrə çıxdı, guya bu sözləri deyirdi:

Söylə, ey həmdəm, kərəm qıl hali-yarımdan mənə,  
Həqq rizası, bir xəbər ver gülüzarımdan mənə!  
Rövşən eylə rəhgüzarım gəl, ey ahi-atəşin,  
Tar olubdur ruzi-rövşən intizarımdan mənə.

Nagah gördü kim, karivani-Leyli, məhbublər sərxeyli yetişdi. Nəhayət şövqlə yügürüb özün onun ayağına salıb bu növ` ədayi-şükr etdi:

Lilləhül həmd ki, çərx etdi müyəssər kamım,  
Cövri-bidad ilə hicr almış idi aramım.

Pəs, ol kim müstəməndi-cigərxun biri-birini qucaqla-yıb sədayi-təhniyətü avazi-mübarəkbad zəminü zəmandan büllənd oldu, mə`şuqə nəzəri-həsrət ilə baxıb dedi:

-Ey aşiqi-dilxuni-müztər, ey növgüli-çəməni-ahəngər1 Bu nə haləti-mükəddərdir kim, müşahidə qılıram? Aya,

gərdişi-dövranü izayi-əbnayi-zəman sənə nə zülmlər etmiş ki, surəti-halın bu məqamə yetmiş?

Əsgəri-biçarə bu sözləri istima edib, seylabi-əşki-çeşmsari çeşmindən cari edib dedi: - Ey yari-dilnəvaz, ey şuxi-işvəbaz!

Ey rövşəneyi-düçeşmi-xunbar,
Arami-dili-həzini-bimar!
Kami-dili arizuyi-didə,
Asayişi-cani-möhnətasar.

Kim mənə izayi-hal etməyə qadir olur? Surəti-əhvalimə təərrüz qılır kim, bu növ dilxəstəvü rəncur etsin? Və ya gərdişi-dövrandan, aləmi-həvadisati-zəmandan nə bakim var ki, əncami-karım bu məqamə yetsin?

Mənəm novgüli-baği-ahəngəri,
Mənəm valideynin əziz Əsgəri.
Mənəm kim, atam çakucundan səda
Alır günbədi-çərxi-neylufəri.
Onun kurəsindən bülənd olsa gər,
Fələkdə şərər yandırar əxtəri.
Verir xəlqi suri-Srafiltək
Fənayə onun dəminin dəmləri.
Əgər Gavə tək röyəti-rəzm aça,
İtaət qılar aləminüəksəri.
Onun sümtəraşi zibəs tizdir,
Edib münfəil tiğü xəncəri.
Əgər görsə Rüstəm onun zərbini,
Şücaətdə eylər vücudun bəri.

Əmma sənin daği-fəraqindən bu növ pərişan olmuşam. Və həvayi-güli-rüxsarindən qönçeyi-növxiztək bağrı qan olmuşam.

Sənin fəraqın alıbdır qərarü taqətimi,
Səmumi-qəhrilə bərgi-gülüm xəzan olmuş.
Edəndə yad o gün arizin ənadiltək.
Həmişə virdi-ləbim naləvü fəğan olmuş.

Mə`şuqəsi dedi:

- Ey cani-şirin! Mən dəxi səndən ayrı çəkdiyim bəlaləri şərh etsəm, baisi-italeyi-məqal olur ki, ədəmi-izhar münasibdir. Hala bir tədbir et kim, səbəbi-müvasilət olsun.

Bir yan fələk cəfası mənimçün qəm artırır,
Bir yan zəmanə gərdişi min matəm artırır.
Bir yan həsud tə`nəsi bağrımı qan edər,
Bir yan qərib cövri bəla hər dəm artırır.
Eşqin bəlası sineyi-pürxunə ah kim,
Hər ləhzə cərahəti-bimərhəm artırır.
Bunlar qamusu səhldir, asan tədariki,
Hicran dili-həzinə qəmi-aləm artırır.
Bir çarə fikrin eylə məcali-vüsal üçün
Hicrani-dövr daiyeyi-ə`zəm artırır.

Və atan övsafini bəyan etdiyindən madəri-mehribanım dəxi ona təəşşüq yetirmiş. Nə ola əgər varub təcəssüsi-əhkami-şəriət edəsən, əgər caizü mübah olsa, məni sən aldıqdan sonra valideyni-namdarimi də ki, validi-büzürgüvarın təzvici ilə şad qılasan ki, əhli-beyt arasında təfriqə düşməsin. Və Abbas, Hüseyn bir-birindən ayrılmasın və məcmu müxəlləfati-mətrukatə malik olub validi-alimiqdarım məqamində namülbədəl olasan.

Bir daha qismət bizə ənduhi-hicran olmasın,
Xatiri-cəm`iyyətim qəmdən pərişan olmasın.
Taki, təxti-gülbün üzrə gül qoyar başına tac,
Könlümün şəhrinə səndən özgə sultan olmasın!

Pəs, Əsgəri-biçarə dəxi bu məsləhətdən mülahizeyi-ümidi-xeyr edib, bir fazili-fərzanə və yeganeyi-dövri-zəmanə hüzurinə varıb kəşfi-məal təriqilə istifsar qıldı ki:

- Bir kimsə əgər bir səbiyyəni həbaleyi-nikahə gətirsə, nagah validi-mənkuhə validəsindən təməttöi-təzvic almaq caizmidir?

Çün məzhəbi-eşqdə bu surət məqami-işkal idi, ol fazil məs`ələni fitvayi-piri-eşqə mühəvvəl qıldı. Hənuz kaşaneyi-üqdeyi-mətləb təviqdə qalmışdı. Bir gecə kim, ərusi-cəhana-ray mehri-ənvari-zülməti-şamdan zülfi-mişkin rüxsarinə töküb hideyi-rüb`də aram buldu və mahi-şəbəfruz məclisi-sur mürəttəb edib ki, şəbi-tarı qeyrəti-ruz və surəti-Leyli tək zinətənduz qılıb dirhəmü dinar səvabitü səyyari-əflakdan təbəqlər doldurub nisar üçün amadə qıldı:

Mehr oldu büsati-çərxdən dur,
Mah aldı əlinə şəm`i-kafur.
Bir türfə şəbü xöcəstəfərcam,
Onun kimi görməmişdi əyyam.
Novruz günündən ol füzun qədr,
İzzətlə misali-leylətül-Qədr

Cümlə xəlayiq xabi-rahətdə olub Əsgəri-müztər səri-təhəyyür balini-ənduhə qoyub, gah əğyari-dilazar cövrin yad edib naləbü əfğan çəkərdi, gah möhnəti-fəraqi-gülüzardan, seylabi-əşk səfheyi-rüxsarə tökərdi və deyərdi:

Qəm canimə qəsd eylər əlim yarə yetişməz,
Mətlubə nədəndir dili-biçarə yetişməz.

Hicran çəkərəm hali-pərişan, günüqarə,
Ümmid əlim ol türreyi-tərrarə yetişməz.

Başlar dili-şuridə fəğan yardən ayrı,
Bir bülbülə manənd ki, gülzarə yetişməz.

Aramımı bir dilbəri-şirindəhən almış,
Kim, tuti dili ondakı göftarə yetişməz.

Hərçənd ki, var qönçədə yüz növ` nəzakət,
Bihudədir, ol lə`li-güvhərbarə yetişməz.

Guya, tutalım, hüsndə məşhuri-cahandır,
Rüxsari-gül, əmma güli-rüxsarə yetişməz.

Yansın bu necə tale` varundu ki, Əsgər,
Ömrün tükədir hicrdə, dildarə yetişməz.

Və gəh fələki-gəcrəftardən şikayətlər edib bu sürud ilə mütərənnüm olurdu:

Görəyim dövrü fələk mən kimi naşad olsun,
Qoymadı əhli-vəfa qüssədən azad olsun.
Dağılıb bir-birə dəysin rəvaqi-niyli,
Könlümün şəhri kimi qübbəsi bərbad olsun.

Və gah məhbubeyi-dilarami-cansitanının şahidi-xəyalini müxatəb qılib söylərdi:

Yox səndə qəmi-eşqdən, ey düst, nişanə,
Mən qəmzədənin surəti-halın nə bilirsən?
Sən bəstəri-rahətdə tutub təkyəgəhi-xab,
Aşiqlərin əndudi-məlalın nə bilirsən?

Xülasə, ol qədər naləvu şivən qildi ki, bihuş olub, dideyi-zahirbini bağlanıb çeşmi-bəsirət açdı.Aləmi-rö`yada gördü ki, məğfuri-mərhum, müəllimi-mə`lum qəbrindən qiyam edib məscidə gəldi. Mənbər üzrə çıxıb möizələr qılırkən dedi:

- Handadır mənim canişinim?

Pəs, Əsgəri-xunincigər ləbbeykguyan ehrami-ixlas bağlayıb təhsili-səfayə sə`y edib, kəndisin Kəbeyi-məqsudə qurban vermək üçün məqamından durub hüzurinə getdikdə dedi:

- Ey nuri-didə! Düxtəri-nikəxtərimi sənə təzvic etdim. Bundan sonra mənim malım və əyalım sənə məxsusdur. Amma gərəkdir ki, mənim Abbasımı əziz tutasan, nəvazişlər edəsən:

Yetim olan kəsə əlbəttə qəmgüsar olmaz,
Zəlili-aləm olur, izzü e`tibar olmaz.
Bəlalər içrə qılır dərbədər, dəmi keçməz
Ki, bağrı qanə dönüb didə-əşkbar olmaz.

Ələssəbah kim, talieyi-sübhi-sadiq bu məzmuni-zövqəfzayə müvafiq kəraneyi-üfüqdən zahir olub giriftari-zülməti-aləm olanlara ruzi-rövşəndən bəşarətlər verdi. Əsgəri-müztər bu rö`yayi-sadiqdən əhbabə hekayət qıldı və müsaidəti-əltafi-zülcəlalə talib olub, mütərəssidi-tə`vil oldu və bu rübaini virdi-zəban etdi:

Gərçi ahü naleyi-biixtiyar eylər könül,
Zikri övsafilə dəf`i-intizar eylər könül.
Hicr əyyamində bəs kim, qüssə tul əncam olur,
Saətin – ay, hər günün bir il şümar eylər könül.

Ümidvaram ki, inşaallah-təala ənqərib peyvəndi-müvasilət aralarında vaqe olub, ədayi-təhniyət qılıb mübarəkbad edim və ol məzmunə nüsxeyi-cədid inşa qılım:

İlahi, bu duami müstəcab et,
Hüsuli-mətləbi-feyz intisab et!

***

Əlhəmdü livahibül-ətiyyə,
Vəşşükr lixaliqil-bəriyə...
Kim xameyi-mişkbarim etmiş,
İzhari-məratibi-əliyyə.
Bir türfə kitab edib mürəttəb
Əhbab üçün etmişəm hədiyyə.
Tövfiqi-səadətilə olmuş,
İtmam: “Kitabi-Əsgəriyyə”.
Şayəd ki,  vəsileyi-nicatım
Olsun bu ümuri-mə`nəviyyə.

## Mündəricat



**«Elm və təhsil» nəşriyyatının direktoru:**
**professor Nadir MƏMMƏDLİ**
Dizayn: ***Zahid Məmmədov***
Texniki redaktor: ***Rövşanə Nizamiqızı***

Yığılmağa verilmiş **14.06.2013**
Çapa imzalanmış **23.08.2013**
Şərti çap vərəqi **7,2.** Sifariş № **502**
Kağız formatı **60x84 1/16.** Tiraj **500**

Kitab **«Elm və təhsil»** nəşriyyat-poliqrafiya
müəssisəsində hazır diapozitivlərdən çap olunmuşdur.
**E-mail:** ***nurlan1959@gmail.com***
Tel: 497-16-32; 050-311-41-89
Ünvan: Bakı, İçərişəhər, 3-cü Maqomayev döngəsi 8/4.

